QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

*BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!*
*Məhəmməd Peyğəmbər (S.)*

May 2015
05 (1069)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ


## Prezident İlham Əliyev Azərbaycan Xalq Cümhuriyyətinin şərəfinə ucaldılmış abidəni ziyarət edib

**Mayın 27-də Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev Azərbaycan Xalq Cümhuriyyətinin şərəfinə paytaxtın İstiqlaliyyət küçəsində ucaldılmış abidəni Respublika Günü münasibətilə ziyarət edib.**

**Abidənin ətrafında fəxri qarovul dəstəsi düzülmüşdü.**

**Dövlətimizin başçısı abidənin önünə əklil qoydu.**

**Azərbaycan Respublikasının dövlət himni səsləndirildi.**

* * *

1918-ci il mayın 28-də Azərbaycan Xalq Cümhuriyyətinin yaradılması xalqımızın tarixinə şanlı hadisə kimi daxil olub. Müstəqil, azad, demokratik respublika qurmağı qarşısına məqsəd qoyan Azərbaycan Xalq Cümhuriyyəti cəmi 23 aylıq fəaliyyəti dövründə xalqımızın milli mənlik şüurunu özünə qaytarıb, onun öz müqəddəratını təyin etməyə qadir olduğunu nümayiş etdirib.



Doxsan yeddi il əvvəl mayın 28-də Tiflisdə qəbul edilmiş "İstiqlal Bəyannaməsi"ndən - "Əqdnamə"dən də göründüyü kimi, bu möhtəşəm tarix xalqımızın müstəqillik amalını daha da gücləndirib.

XX əsrin sonunda yenidən müstəqilliyinə qovuşan Azərbaycan öz suverenliyini qoruyub saxlamağı bacarıb. Ümummilli lider Heydər Əliyev Azərbaycan dövlətçiliyinin qorunması üçün qətiyyətli tədbirlər görüb, ölkədə davamlı ictimai-siyasi sabitliyi bərqərar edib. Ulu öndər Heydər Əliyevin şah əsəri olan müasir müstəqil Azərbaycan dövləti sürətli inkişaf yoluna qədəm qoyub.

Şərqdə ilk demokratik respublika olan Azərbaycan Xalq Cümhuriyyəti XX əsrin sonunda yenidən istiqlaliyyətinə qovuşan müstəqil Azərbaycanın şərəfli tarixində böyük mərhələnin başlanğıcını qoyub. Xalqımız Azərbaycan Xalq Cümhuriyyətinin yarandığı bu şərəfli tarixi - 28 Mayı Respublika Günü kimi qeyd edir.

**AZƏRTAC**

## Ümummilli lider Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü münasibətilə ümumuniversitet toplantısı və "Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan" mövzusunda elmi konfrans keçirilib





May ayının 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü münasibətilə ümumuniversitet toplantısı və "Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan" mövzusunda elmi konfrans keçirilib. Qeyd edək ki, ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi əvvəlcə Fəxri Xiyabanda ulu öndər Heydər Əliyevin məzarını ziyarət edib, məzarı önünə əklil və gül dəstələri qoyublar. Xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri qoyulub. Sonra universitetdə ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətinə həsr olunmuş kitab sərgisinə və Heydər Əliyev Muzeyinə baxış keçirilib, daha sonra isə Böyük Akt zalında ümumuniversitet toplantısı və konfransın plenar iclası keçirilib. Tədbirdə ilk olaraq ulu öndər Heydər Əliyevin və akademik Zərifə Əliyevanın xatirələri bir dəqiqəlik sükutla yad edilib.




ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov tədbiri giriş sözü ilə açaraq bildirib ki, may ayının 10-da Azərbaycan xalqının dahi oğlu, qüdrətli siyasi xadim, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü tamam olur. Mart ayından başlayaraq ADPU-da ulu öndərimiz Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü münasibətilə müxtəlif silsilə tədbirlər - respublika miqyaslı elmi konfranslar, beynəlxalq simpozium, professor-müəllim heyətinin elmi əsərlərin təqdimatı, seminarlar, dəyirimi masalar, ali məktəb tələbələrinin bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi keçirilib. Bu gün bütün təhsil müəssisələrində olduğu kimi, ADPU-da da ilk dərs saatları ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətinə həsr olunub.

Rektor Y.Məmmədov qeyd edib ki, ümummilli liderimiz Heydər Əliyev Azərbaycanın müstəqil bir dövlət kimi yaşamasını təmin etmək üçün onu möhtərəm Prezidentimiz cənab İlham Əliyevə tapşırdı. Heydər Əliyevin müdrik siyasi məktəbinin layiqli davamçısı olan cənab Prezidentimiz İlham Əliyev də Ulu Öndərimizin xalqımız və dövlətimizlə bağlı ideallarına sadiqlik nümayiş etdirərək müstəqil dövlətimizi daha da gücləndirdi və inkişaf etdirdi. Ölkəmizin beynəlxalq siyasi nüfuzu xeyli yüksəlmişdir. 2011-ci il oktyabr ayının 24-də Azərbaycanın 155 ölkənin böyük etimadı və dəstəyi ilə Birləşmiş Millətlər Təşkilatının Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçilməsi dövlətimizin böyük siyasi uğurudur. Azərbaycan son illər möhtəşəm beynəlxalq tədbirlərə yüksək sə-

**(Davamı 2-ci səhifədə)**

# Ümummilli lider Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü münasibətilə ümumuniversitet toplantısı və "Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan" mövzusunda elmi konfrans keçirilib

(Əvvəli 1-ci səhifədə)

viyyədə ev sahibliyi edir. Ölkəmiz tolerantlıq və multikulturalizim baxımından bütün dünya üçün layiqli örnəkdir. Ulu öndər Heydər Əliyevin müdrik siyasi kursu, strateji dövlətçilik xətti müstəqil dövlətimizn bugünkü böyük uğur və nailiyyətlərinin əsas təminatçısıdır.




Tədbirdə Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mais Əmrahov ümummilli lider Heydər Əliyevin həyat və fəaliyyəti haqqında məruzə ilə çıxış edib. Professoru Mais Əmrahov bildirib ki, ulu öndər Heydər Əliyev öz fədakar və vətənpərvər fəaliyyəti ilə adını xalqımızın ictimai-siyasi fikir və dövlətçiliyi tarixinə qızıl hərflərlə yazıb. Ulu öndər Heydər Əliyev həyatımızın bütün sahələri kimi, elm və təhsilin inkişafına böyük diqqət yetirirdi. Məhz ulu öndər Heydər Əliyevin uzaqgörən siyasəti nəticəsində istedadlı azərbaycanlı gənclərin keçmiş SSRİ-nin qabaqcıl və nüfuzlu ali təhsil müəssisələrində təhsil almalar sahəsində səmərəli işlər görülmüşdür. Belə ki, ötən əsrin 80-ci illərinin əvvəllərində hər il 1000-1400 nəfər azərbaycanlı gənc respublikamızdan kənarda ali təhsil almağa göndərilirdi. Məhz Ulu Öndərin şəxsi təşəbbüsü ilə 1970-1980-ci illərdə keçmiş SSRİ-nin 50-dən artıq böyük şəhərinin 170-dən çox




nüfuzlu ali məktəblərində respublikamızın xalq təsərrüfatı, elm, təhsil və mədəniyyətinin 80-dən artıq sahəsini əhatə edən və zəruri ehtiyac duyulan 250-dən çox ixtisas üzrə 15 mindən artıq azərbaycanlı gənc ali təhsil almışdır.

Böyük şəxsiyyət Heydər Əliyev sözün həqiqi mənasında millətçi idi, lakin onun bu millətçiliyi şovinizimdən, milli özünəqapanmadan çox uzaq idi. Ulu Öndər Azərbaycanı bütöv dünyanın ayrılmaz bir parçası kimi görürdü və ölkəmizin yüksəlişi, hərtərəfli inkişafı üçün fədakarcasına çalışırdı.



Tədbirdə ADPU-nun dosenti, şair-publisist Xankişi Bəxtiyar ulu öndər Heydər Əliyevə və akademik Zərifə Əliyevaya həsr etdiyi şeirlərini oxuyub, eyni zamanda Ulu Öndərə həsr olunmuş film nümayiş etdirilib, həmçinin Filologiya fakültəsinin tələbələri bədii-musiqili kompozisiya təqdim ediblər. Daha sonra "Heydər Əliyev məktəbinin lektoriyası"nda "Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan" mövzusunda elmi konfrans maraqlı məruzə və müzakirələrlə davam etdirilib. Konfransda ADPU-nun professor-müəllimləri, həmçinin YAP-ın Siyasi Şurasının üzvü, Milli Məclisin deputatı Aydın Mirzəzadə ümummilli lider Heydər Əliyevin dövlət quruculuğunun, elm, təhsil və mədəniyyətin, həmçinin iqtisadiyyatın, idmanın inkişafındakı rolu ilə bağlı maraqlı və məzmunlu çıxışlar ediblər.

**Mənsur İBRAHİMLİ**

# ADPU-da "Qanlı Yanvar" bədii filmi nümayiş etdirilib

May ayının 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük akt zalında universitet rəhbərliyinin, professor-müəllim heyətinin və tələbə kollektivinin geniş iştirakı ilə "ANS Müstəqil Yayım və Media Şirkəti"nin sifarişi ilə istehsal olunmuş "Qanlı Yanvar" bədii filmi nümayiş etdirilib, həmçinin filmin yaradıcı heyəti ilə görüş keçirilib. Xüsusi qeyd edək ki, bu film Azərbaycan Pespublikasının Prezidenti cənab İlham Əliyevin dəstəyi ilə ərsəyə gəlib. Beynəlxalq aktyor heyətinin iştirak etdiyi və təxminən 2 saat 10 dəqiqə davam edən "Qanlı Yanvar" bədii filmi Azərbaycanın ən yeni tarixinin şanlı məqamlarını özündə əks etdirir.

Filmdə Azərbaycan xalqının XX əsrin 80-ci illərinin sonları, 90-cı illərinin əvvəllərində öz milli azadlığı və suverenliyi uğrunda apardığı mübarizənin 20 Yanvar səhifəsi bədii təcəssümünü tapıb. Xalqımız, millətimiz həmin dövrdə öz ərazi toxunulmazlığı və dövlət müstəqilliyinin bərpası uğrunda böyük bir imperiya ilə mübarizəyə qalxdı və Sovet Ordusu tərəfindən vəhşi cəza tədbirlərinə məruz qaldı. Belə ki, Bakıya və o cümlədən Azərbaycanın rayon və şəhərlərinə daxil olan Sovet Ordusu tank və digər ağır texnika ilə qarşısına çıxan soydaşlarımızı vəhşicəsinə qətlə yetirirdi. Ən böyük qarşıdurma və toqquşmalar isə paytaxt Bakı şəhərində baş vermişdi. Sovet Ordusunun vəhşiliyi nəticəsində 140-a yaxın soydaşımız, 30-a qədər əsgər və zabit həlak olmuşdu. Qürur hissi ilə deyə bilərik ki, azadlıq arzusu ilə yaşayan gənclər və yeniyetmələr həmin gün həyatda ən şirin nemət olan canlarından belə keçməyə hazır olduqlarını sübut etdilər.



Onu da qeyd edək ki, "Qanlı Yanvar" filmi 1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə baş verən faciəli hadisələri bizə bir azərbaycanlı ailəsinin-Nərimanovlar ailəsinin şəxsində göstərir. İki qardaş- Dövlət Təhlükəsizlik Komitəsinin zabiti, kommunist Nəcəf və Sovet Ordusunun keçmiş zabiti, indi inqilabçı-demokrat Mehdi bir-birinə əks siyasi düşüncələrinə görə ölüm-dirim mübarizəsinə qalxıblar. Filmin dramatik hadisələrinin mərkəzində isə onları boya-başa çatdıran ANA - Xədicə xanım bir sipər kimi dayanır. Hər iki qardaş Azərbaycanı çiçəklənən və firavan görmək istəyir. Xədicə xanımın sözləri ilə desək " sadəcə, onların yolları və yoldaşları ayrıdır!" Vətən, ana və ailə məhəbbətlərinin qarşılaşdırıldığı film sonadək hər kəsin öz həqiqətini tanıyır, qəbul edir. Amma bütün həqiqətlərdən ali bir həqiqət də var ki, bu da azadlıq, müstəqillikdir. Qanlı Yanvar hadisələrinin şahidi və iştirakçısı olan rejissor Vahid Mustafayev filmdə real hadisələri canlandırmaqla qarşıda duran bir sıra suallara cavab tapmağa çalışıb - müstəqilliyin qiyməti, anaların və övladların məsuliyyəti çətin, mürəkkəb, böhranlı anlarda necə hesablanır, ümumiyyətlə, əlində silah olan bir kəs ədalətli ola bilərmi Rejissor Vahid Mustafayev bu suallara obyektiv cavab tapa bilib və filmdə bunun uğurlu bədii həllini verib.



Filmin nümayişindən sonra onun yaradıcı heyəti ilə görüş keçirilib. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov görüşdə iştirak edən ANS Şirkətlər Qrupunun vitse-prezidenti Mir Şahin Ağayevə, o cümlədən filmin bütün yaradıcı heyətinə universitetin kollektivi adından və şəxsən öz adından təşəkkürünü bildirib, Vahid Mustafayevi və Mir Şahin Ağayevi universitetin təşəkkürnaməsi ilə təltif edib. ANS Şirkətlər Qrupunun vitse-prezidenti Mir Şahin Ağayev çıxış edərək ADPU-da "Qanlı Yanvar" filminin nümayiş etdirilməsinə verdiyi dəstəyə görə universitetin rektoru, professor Yusif Məmmədova öz minnətdarlığını bildirib.

Qeyd edək ki, ADPU-nun professor-müəllim heyəti və tələbə kollektivi "Qanlı Yanvar" filminin tələbə-gənclərin vətənpərvərlik ruhunda tərbiyə olunmasına müsbət təsir göstərməsini xüsusi qeyd etməklə yanaşı, hamımıza XX əsrin sonlarında azadlıq və milli dövlətçilik uğrunda apardığımız mübarizənin çətinliklərini, keşməkeşlərini bir daha dərindən anlamağa, xüsusilə də, 1990-cı ilin qanlı 20 Yanvar hadisələri ilə bağlı həqiqətləri öyrənməyimizə kömək etdiyini vurğulayaraq filmin yaradıcılarına təşəkkür ediblər.

**Könül NƏZƏROVA**

# HEYDƏR BABA

## ("Heydər baba" poemasından bir parça)

Xəyallar içində boğulur şair,
İlan vurmuş kimi qıvrılır şair.
Keçmişə qayıdır, xəyala dalır,
Axır gözlərindən yaş gildir - gildir.

Keçir xəyalımdan o böyük insan,
Adın saxlayıram hələ ki, pünhan.
Sağ olsaydı, yəqin belə olmazdı,
Bağ-bağçalar saralmazdı, solmazdı.

Alimin, şairin dayağıydı o,
Fağırın, kasıbın çırağıydı o.
Satqını, yaltağı dərhal tanıyar,
Mərdlərə inanar, güvənərdi o!

O, çörək vermişdi milyon insana,
Dünyada çatmışdı böyük ad-sana.
Fəqət Allah -Taala çox gördü bizə,
Vurdu ürəklərə sağalmaz nizə.

Yəqin ki, oxucum anladı məni,
Bəlkə də qəlbində danladı məni.
Odur ki, mətləbə keçirəm daha,
Ürəyim ta dözmür belə bir aha!

Mən söhbət açıram Ulu Öndərdən,
Allahın sevdiyi o bəxtəvərdən.
Ona deyəcəyim çox sözüm vardı,
Pərvaz edib uçan arzularımdı.

* * *

Beləcə, o şair təkcə yanmırdı,
Gündə neçə dəfə onu anırdı.
Ziyarət edirdi tez-tez ulunu,
Yanından salırdı tez-tez yolunu.

Beləcə, bir səhər o şair yenə,
Durub gəldi düz heykəlin önünə,
Baxdı bir heykələ, bir də özünə,
Başladı deməyə zəmanəsindən,
Həqiqət süzüldü hər kəlməsindən.

* * *

Heydər baba, gəldim deyim bu başdan,
Keçərəm yolunda min dəfə başdan.
Qəlbim çağlamasa, qoşmasam dastan,
Mən onda deyərəm şair deyiləm,
Həyatda heç nəyə qadir deyiləm.

Heydər baba, sizə min rəhmət olsun,
Sizi unudana min nəhlət olsun.
Yerin behişt olsun, qoy cənnət olsun,
Şəxsən mən də unutmaram sizləri,
Arxanca qalıbdı şair gözləri.

Heydər baba, o dahini görmürəm
Heydər baba, o natiqi görmürəm,
İlham qədər bir sadiqi görmürəm.
Çox sağ olun, onu bizə bəxş etdiz,
Amma, heyif, bu dünyadan tez köçdüz

Heydər baba, ildırımlar ta çaxmır,
Sizsiz çaylar şaqqıldamır, ta axmır,
Fani dünya dönüb dala heç baxmır.

Siz gedəli mən də yaman düşmüşəm,
Bu dünyadan bir balaca küsmüşəm.

"Heydər baba, yolun bizdən kəc oldu",
Türkiyəyə gələmmədim, gec oldu.
Gözlərimə inanmıram, necoldu?
Ayrılıq qapını belə tez döydü,
Düşmənlər sevindi, ölüm öyündü.

Heydər baba, kaş görəydim sağ səni,
Hanı Sənin kimi sevən Vətəni?!
Gəlginən, gözləyir bağça, bağ səni,
Kaş dönəydin, bir də səni görəydim,
Şəninə şeirdən çələng hörəydim.

Heydər baba, kəklik, turac ta uçmur,
Kol dibindən dovşan qalxıb ta qaçmır.
Bağçalarım çiçəklənib ta açmır,
Laçında tutları düşmənlər yeyir,
Sonra da türklərə "mənəm-mən" deyir.

Heydər baba, ta bulaqlar çağlamır,
"Seygah Zabul" qabaqkı tək ağlamır.
Gördüyün yolları basıbdır mamır,
Nə gələn var yurddan, nə də ki, gedən
Qəlbimi ağrıdıb bax, budur didən.

Heydər baba, hər yan çiskin, dumandı,
Sizsiz keçən günlərimiz yamandı.
Unutmaram and içdiyiz o andı,
Deyirdiniz ölərəm, torpaq vermərəm,
Bircə dərə, bircə bulaq vermərəm!!!

Heydər baba, zaman çox qorxuludu,
Özüm fağır, dərdim dəli - doludu.
İçim başdan - başa dərdlə doludu,
Bilirəm ki, ruhun kömək olacaq,
Ömrümə-günümə bəzək olacaq.

Ay baba, bir sözlə, sizsiz yetiməm,
Gözüm yolda, qəlbim səsdə gəzirəm.
Tək İlhama, Mehribana əminəm,
Bilirəm ki, torpaqları alacaq,
Adı tarixlərdə vallah, qalacaq.

Qarabağın dərdi çox dərindədi,
Çox başda olanlar öz dəmindədi.
Hərə öz kefində, aləmindədi,
İlham bir dahidi mərdlər içində,
Ərənlər içində, ərlər içində.

Heydər baba, üzür çiskin, çən məni,
Sarsıdıbdır kədər məni, qəm məni.
Üstələyib neçə ildir bəm məni,
Hələ nə qoşmuşam, mən nə yazmışam.
Qovğalar içində vallah, azmışam.

Heydər baba, uçub gedib mələyim,
Siz gedəli tərsə əsir küləyim.
Can verməram ta gəlsə də, fələyim,
Laçında, Şuşada bir də olmasam,
Bu arzuma, muradıma çatmasam!..

**Xankişi BƏXTİYAR**

# Elmi Şuranın iclasında

***Azərbaycan Dövlət Pedaqoji Universiteinin (ADPU) Elmi Şurasının may ayının 21-də keçirilən iclasının gündəliyində aşağıdakı məsələlər dayanırdı: 2015-2016-cı tədris ilinə hazırlıq haqqında; Filologiya fakültəsində tədris, elmi-tədqiqat və tərbiyə işlərinin təşkili haqqında hesabat; "Yeni bioloji aktiv birləşmələr" elmi-tədqiqat laboratoriyasının işi haqqında hesabat: cari məsələlər; kafedralar üzrə professor və dosent vəzifələrinə seçkilər.***



ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Elmi Şuranın sədri, professor Yusif Məmmədov iclası giriş sözü ilə açaraq bildirib ki, Təhsil Nazirliyindən ADPU-ya daxil olmuş müvafiq məktub əsasında universitet məzunlarının işə qəbulunun nəticələri araşdırılıb və buna görə də bu məsələnin Elmi Şuranın iclasının gündəliyinə salınmasını təklif edir. Rektor Y.Məmmədovun bu təklifi Elmi Şura üzvləri tərəfindən yekdilliklə qəbul edilib və məsələ gündəliyə salınıb. Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, aparılan araşdırmalar nəticəsində ADPU-nun məzunlarının işə qəbulunun nəticələrinin qənaətbəxş olmaması müəyyən edilib. Rektor qeyd edib ki, biz bu barədə ciddi düşünməli, qüvvələrimizi səfərbər etməli, tələbələrimizin hazırlıq səviyyəsini yüksəltmək üçün səmərəli fəaliyyət göstərməliyik. Professor-müəllim heyəti peşəkarlıq səviyyəsini artırmalı, yüksəkixtisaslı pedaqoji kadrların hazırlanması üçün daha da səylə çalışmalıdır.

"2015-2016-cı tədris ilinə hazırlıq haqqında" Tədris işləri üzrə prorektor, professor Malik Cəbrayılov çıxış edib. Professor M.Cəbrayılov qeyd edib ki, yeni tədris ilinə hazırlıqla bağlı qarşıda dayanan ən vacib vəzifələrdən biri fakültə dekanlıqlarının və kafedraların dərs yükünü vaxtında təqdim etmələridir. Məlum olduğu kimi, Bakıda iyun ayının 12-dən 28-dək Birinci Avropa Oyunları keçiriləcəkdir. Birinci Avropa Oyunları ilə əlaqədar imtahan sessiyası may ayının 31-də başa çatacaqdır. Buna görə də dekanlıqların və kafedraların dərs yükünü vaxtında təqdim etmələri üçün kifayət qədər vaxtları olacaqdır. Dərs yüklərinin vaxtında və dəqiq bölüşdürülməsi növbəti tədris ilində müvəffəqiyyət göstəricilərimizə də təsir göstərir. Bu il universitetin rektoru, professor Yusif Məmmədovun göstərişi əsasında bütün tədris planları kitabça şəklində çap olunaraq paylanılacaqdır. Dekanlıqlar dövlət imtahanları başa çatan kimi dövlət imtahanını vermiş tələbələrin əmrlərini hazırlamalıdırlar. Eyni zamanda aşağı kurs tələbələrinin yuxarı kurslara keçmələri haqqında əmrlər də vaxtında hazırlanmalıdır. Kredit borcu təqaüd alan tələbələrin təqaüdünə təsir etməməlidir. Yay semestri iyul ayında təşkil edilməli və 5 həftə davam etməlidir. Yay semestri dəqiq qrafik əsasında, mövcud təlimata uyğun keçirilməlidir, çünki dərsin öyrənilməsi, mənimsənilməsi vaxtı var. Dekanlıqlar yay semestrinin təqdimatını iyun ayının 10-a kimi verməlidirlər. Həmişə olduğu kimi, yeni dərs ilində də pedaqoji təcrübə mövcud təlimata uyğun keçirilməlidir. Yeni tədris ilindən də IV kursda "Orta təhsil kurikulumunun əsasları" fənni seçmə fənn kimi tədris olunacaqdır. Bir sözlə, yeni tədris ilinə ciddi hazırlaşmaq lazımdır.

"Filologiya fakültəsində tədris, elmi-tədqiqat və tərbiyə işlərinin təşkili haqqında" hesabat məruzəsi ilə Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov çıxış edib. Professor Buludxan Xəlilov hesabat məruzəsində bildirib ki, ADPU yarandığı vaxtdan burada fəaliyyət göstərən şö-bələrdən biri tarix-ədəbiyyat şöbəsi olmuşdur. Bu şöbə 1925-1926-cı tədris ilindən tarix və ədəbiyyat şöbələrinə ayrılmışdır. Ədəbiyyat şöbəsi 1933-cü ildən müstəqil dil-ədəbiyyat fakültəsi kimi fəaliyyətə başlamışdır.

Fakültədə 9 kafedra, 2 elmi-tədqiqat laboratoriyası fəaliyyət göstərir: Müasir Azər--baycan dili, Azərbaycan dilçiliyi, Azərbaycan dilinin tədrisi metodikası, Azərbaycan və dünya ədəbiyyatı tarixi, Folklor və qədim ədəbiyyat, Ədəbiyyatın tədrisi metodikası, İngilis dili və onun tədrisi metodikası, Xarici dillər, Rus dili kafedraları, Dədə Qorqud və Türk araşdırmaları elmi - tədqiqat laboratoriyaları.

Fakültənin professor-müəllim heyətinin tərkibində 20 nəfər elmlər dok-toru, professor, 40 nəfər elmlər namizədi, dosent, 2 nəfər əvəzçiliklə do-sent, elm-lər namizədi, 14 nəfər baş müəllim, elmlər namizədi, 49 nəfər müəllim çalışır. Fakültədə 1999-2000-ci təd-ris ilindən dil və ədə-biy-yat ixtisaslarından əlavə, fran-sız dili, 2001-2002-ci tədris ilin-dən isə ingilis dili ixtisasları üzrə müəllimlər ha-zır-lanır.

Fakültədə hazırda 1239 nəfər tələbə təhsil alır: 962 tələbə əyani şöbədə, 277 tələbə qiyabi şöbədə. Ali təhsilin magistratura pilləsində Filologiya fakültəsindən 140 nəfər magistrant təhsil alır. Fakültədə hazırda 9 aspirant, 10 dissertant vardır. Bakalavr pilləsində tələbələr üç ixtisasa: Azərbaycan dili və ədəbiyyatı (əyani və qiyabi), ingilis dili (əyani), fransız dili (əyani), magistraturada isə 8 ixtisasa: Azərbaycan dili, Ümumi dilçilk, Ədəbiyyat nəzəriyyəsi, Azərbaycan ədəbiyyatı, Fok-lor-şü-naslıq və mifologiya, Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası, ingilis və fransız dilləri ixtisaslarına yiyələnirlər. Bakalavr və magistrantların yüksək ixti-sas-lara yiyələnmələri üçün fakültədə hər cür şərait yaradılmış, yüksəkixtisaslı pro-fessor-müəllim heyəti əzmlə çalışır. Aparılan işlər, keçirilən çoxsaylı təd-bir-lər onların elmlərə yiyələnməsinə, gənc bir müəllim kimi formalaşmasına xidmət edir. Hər bir gəncin elmi yaradıcılıqla məşğul olması üçün lazımi şərait yara-dılmışdır.



Hazırda Filologiya fakültəsi ADPU-nun kadr potensialına görə böyük fakültələrindəndir. Burada 1224-dən çox tələbənin təhsil-tərbiyəsi ilə 200 nəfərdən çox professor-müəllim heyəti, köməkçi-tədris işçiləri məşğul olur. Hazırda Filologiya fakültəsinin tələbələri kredit sistemi ilə təhsil alırlar.

Filologiya fakültəsi şərəfli bir yol keçmiş, həmişə öz məzunları ilə fəxr et-mişdir. Vaxtilə bu fakültədə təhsil almış yüzlərcə tələbə öz əməli fəaliy-yətləri ilə universitetimizə şərəf gətirmişlər: S.Vurğun, M.Rahim, M.Dilbazi, C.Xəndan, H.Araslı, M.Hüseynzadə, O.Sarıvəlli, Əbülhəsən, M.Cəfər, M.H.Təhmasib, M.C.Pa-şayev, M.İbrahimov, İ.Şıxlı və digərləri.İndiyə qədər fakültəmizin 12000-dən çox məzunu olmuşdur.

Fakültədə fəa-liy-yət göstərən kafedraların apardığı elmi-tədqiqat işlərinin istiqaməti respublika miqyasında elmi nailiyyət kimi qiymətləndirilməlidir. Konkret olaraq kafedralar üzrə elmi araşdırmaların əsas istiqamətini belə göstərmək olar. Azərbaycan dilçiliyi kafedrası Azərbaycan onomalogiyası, ümumi dilçilik, Azərbaycan dilçiliyinin problemləri, türkologiya istiqamətində elmi- tədqiqat işləri aparır və bunun nəticələrini elmi məqalələrdə, monoqrafiya, dərslik və dərs vəsaitlərində çap etdirir. Müasir Azərbaycan dili kafedrası müasir dil, ono-mastika, türkologiya və s. istiqamətdə elmi işlərə xüsusi diqqət yetirir. Azər-baycan və dünya ədəbiyyatı tarixi, Folklor və qədim ədəbiyyat kafedraları ədə-biyyat tarixi, müasir ədəbiyyat, folklor, ədəbiyyatın problemləri, xarici ölkələr ədəbiyyatı, ədəbiyyat nəzəriyyəsi və ədəbiyyatşünaslıq istiqamətində dərslik, dərs vəsaiti və monoqrafiyalar çap etdirir, respublikamızın ədəbi-elmi mühi-tində ləyaqətlə təmsil olunurlar.

Azərbaycan dili və onun tədrisi metodikası, Azərbaycan ədəbiyyatı və onun tədrisi metodikası kafedraları dilmizin və ədəbiyyatımızın tədrisinə dair dərsliklərin, dərs vəsaitlərinin, metodik göstərişlərin yazılmasında respublika dairəsində tanınan, sayılan, seçilən kafedralardır.

İngilis dili və onun tədrisi metodikası, Xarici dillər və Rus dili kafedraları ümumuniversitet kafedraları olmaqla daha çox praktik işə-tədrisə üstünlük verir, tələbələrimizin xarici dilləri öy-rənmələri üçün əllərindən gələni əsirgəmirlər. Yarandığı gündən indiyə qədər Filologiya fakültəsinin əməkdaşları tərəfindən 150 dərslik və dərs vəsaiti, 50 metodik göstəriş, 100-ə yaxın monoqrafiya yazılmışdır.

Filologiya fakültəsindəki kafedraların hər birinin Azərbaycan elminin inkişafında xüsusi xidmətləri var. Onların fədakar əməyi ən yüksək qiymətə layiqdir. Təsadüfi deyildir ki, universitetimizin 85 illik yubileyində fakültəmizin 9 əməkdaşı Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə mükafatlandırıldı. 3 nəfər əməkdaşımız "Əməkdar müəllim" fəxri adına, 1 nəfər "Əməkdar elm xadimi" fəxri adına layiq görüldü, 5 nəfər əməkdaşımız isə "Tərəqqi" medalı ilə təltif edildi.

Fakültədə tələbə elmi cəmiyyəti müntəzəm olaraq tələbələrin elmə olan marağını artırmaq isti-qamətində işlər görür. Hər il tələbələrin elmi fəaliyyəti yekunlaşır və seçilən tə-ləbələr müvafiq yerlər üzrə mükafatlandırılır. Tələbələrimiz respublika olimpiadalarında fəal iştirak edir, ayrı-ayrı universitetlərdə təşkil olunmuş konfranslarda məruzələrlə çıxış edirlər.

Fakültədə Cəfər Xəndan auditoriyası fəaliyyət göstərir, «Gənc filoloq» adlı divar qəzeti müntəzəm çap olunur. «Gənc dil-çilər» və «Gənc ədəbiyyatçılar» adlı iki dərnək tələbələrin yaradıcılıq qabiliyyətinin inkişaf etdirilməsi istiqamətində mühüm işlər görür. Bu dərnək-lərə dilimizə və ədəbiyyatımıza marağı olan tələbələr cəlb olunur. Onlar indidən bədii yaradıcılığın və ədəbiyyatşünaslığın, dilçilik elmlərinin sirlərinə yiyələnirlər.

Filologiya fakültəsində müntəzəm olaraq şairlərlə, yazıçılarla, ziyalılarla görüşlər keçirilir. Son illərdə bu qəbildən olan görüşlər içərisində Əlibala Hacızadə, Nəriman Həsənzadə, Anar, Fikrət Qoca və digərləri ilə olan görüşlər, Rəsul Rzanın, Cəfər Xəndanın, Mir Cəlal Paşayevin, Zərifə Budaqovanın, Mirzə İbrahimovun və başqalarının yubiley tədbirləri yüksək səviyyədə keçirilməklə yanaşı, həm də tələbələrimizin yaddaşına həkk olunmuş, onların mənəvi cəhətdən zənginləşməsində böyük rol oynamışdır. Müntəzəm olaraq kafedralar üzrə əməkdaşların açıq dərsləri təşkil olunur. Bunların hamısı təbii ki, tədrisə və təhsilə müsbət təsir göstərir.

"Yeni bioloji aktiv birləşmələr" elmi-tədqiqat laboratoriyasının (ETL) işi haqqında hesabatla laboratoriyanın müdiri, kimya üzrə fəlsəfə doktoru Rəhimə Məmmədova çıxış edib. Rəhimə Məmmədova bildirib ki, "Yeni bioloji aktiv birləşmələr" elmi - tədqiqat laboratoriyası 16.09.1989-cu il tarixdə yaradilmişdir. Hazırda "Yeni bioloji aktiv birləşmələr" elmi - tədqiqat laboratoriyasında 7 nəfər çalışır. ETL-də aparılan elmi-tədqiqat işlərinə uyğun olaraq 3 əməkdaş dissertasiya müdafiə etmiş və kimya üzrə fəlsəfə doktoru alimlik dərəcəsi almışdır.

ETL-in əsas funksiyalarının sırasına tədris prosesində yaranan elmi məsələlərin həlli istiqamətində lazımi araşdırmalar aparmaq da daxildir. Bu istiqamətindəki fəaliyyətin aşağıdakı nəticələri mövcuddur: ETL-də 2 yeni fənn (Polimer kompozisiyalar kimyası və MTT (kimya elmləri üzrə)) üçün lazımi tədris-metodik materiallar ilk dəfə işlənib hazırlanmışdır. Bununla yanaşı, kimyanın yeni sahəsi üzrə ilk dəfə işlənib hazırlanmış tədris-metodik materiallardan istifadə - yeni fənnin tədrisi Kimya ixtisasları üzrə təhsil alan tələbələrin müvafiq elmin müasir inkişaf səviyyəsinə uyğun ixtsaslaşmasına töhfə verər. Hazırda ETL-də bir fənnin - Aşqarlar kimyasının tədris-metodik materialları təkmilləşdirilir. ETL-də elmi-tədqiqat işlərini intensivləşdirmək məqsədi ilə qrant layihəsi hazırlanaraq Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fonduna təqdim edilmişdir.

"Yeni bioloji aktiv birləşmələr" ETL hazırda Bakı Dövlət Universiteti, AMEA-nın Aşqarlar Kimyası İnstitutu, AMEA-nın Neft-Kimya Prosesləri İnstitutu, AMEA-nın Polimer Materialları İnstitutu, Azərbaycan Tibb Universiteti, Azərbaycan Dövlət Neft Akademiyası, Rusiya EA-nın Element-Üzvi Birləşmələr Kimyası İnstitutu ilə elmi əməkdaşlıq edir. Eyni zamanda Sumqayıt Texnologiyalar Parkı ilə qarşılıqlı əməkdaşlıq haqqında müqavilə bağlanması üçün razılıq əldə edilmişdir. Müqaviləyə əsasən aşağıdakıların təmənnasız reallaşması mümkündür: ETL əməkdaşlarının STP-nin laboratoriyalarında mövcud olan müasir cihaz və avadanlıqlardan istifadə etmək imkanı; Kimya fakültəsinin tələbələrinin (hər tədris ilində 5 qrup) istehsalat təcrübəsinin müasir standartlara uyğun fəaliyyət göstərən kimya müəssisələrində təşkili və s. ETL-də sintez edilən antimikrob birləşmələrin dərman maddələri kimi istifadə imkanlarını dəqiqliklə araşdırmaq üçün Pakistanın müvafiq Elmi-Tədqiqat İnstitutu ilə əməkdaşlıq da planlaşdırılır.

ETL-in əməkdaşları həmçinin 2009-cu ildə ümummilli lider Heydər Əliyevin anadan olmasının 86-cı ildönümünə həsr edilmiş "Kimya və ekologiyanın aktual problemləri" mövzusunda Respublika Elmi Konfransının təşkilində, habelə 2013-cü ildə ulu öndər Heydər Əliyevin 90 illik yubleyinə həsr olunmuş "Ekoloji problemlər və ekoloji təhsil" mövzusunda Respublika Elmi Konfransının təşkilində fəal iştirak etmişlər.

Qeyd edilənlərdən savayı, ETL-in əməkdaşları Tələbə Elmi Cəmiyyəti (TEC) ilə sıx əməkdaşlıq edir. Belə ki, hər tədris ilində ETL-in əməkdaşalrı təxminən 10 nəfər tələbənin ilkin araşdırmalarına, konfranslarda çıxışlarına elmi köməklik edirlər. Belə ki, 5 nəfər tələbənin 2-3 may 2013-cü il tarixində Türkiyə Respublikasının İstanbul şəhərində yerləşən Maltəpə Universitetində keçirilən Beynəlxalq Tələbə Konqresində iştirakına, habelə 2 nəfər tələbənin bu il aprel ayının 17-də gənclərin Qafqaz Universitetində təşkil edilən III Beynəlxalq Elmi Konfransında iştirakına elmi və təşkilati köməklik edilmiş, həmçinin TEC-in xətti ilə müəyyən qədər təcrübə əldə etmiş 1 nəfər tələbənin qrant layihəsinə rəhbərlik etməsinə və həmin layihənin hazırlanıb Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fonduna təqdim edilməsinə köməklik göstərilmişdir.

ETL əməkdaşları respublika səviyyəli tədbirlərdə: Tələbə Qəbulu üzrə Dövlət Komisiyasının (TQDK) seminar və imtahanlarında, beynəlxalq səviyyəli sərgi-konfranslarda, dövlət təşkilatlarının təşkil etdiyi tədbirlərdə fəal iştirak edirlər. Qeyd edilənlərlə yanaşı, ETL-in əməkdaşları fakültə və universitetin tədbirlərində də yaxından iştirak edirlər.

Çıxışının sonunda R.Məmmədova elmi-tədqiqat işlərinin nəticələrinin istifadəsi, həmçiniin başçılıq etdiyi ETL-də elmi araşdırmaların intensivləşməsi üçün təkliflərlə çıxış edib.

Elmi Şuranın iclasında cari məsələlər müzakirə edilib, kafedralar üzrə professor və dosent vəzifələrinə seçkilər keçirilib.

**Mənsur İBRAHİMLİ**

# 28 May - tariximizin şanlı səhifəsi

## *28 May-Respublika Gününə həsr edilmiş tədbir keçirilib*

***May ayının 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) “Heydər Əliyev məktəbinin lektoriyası”nda 28 May-Respublika Gününə həsr edilmiş dəyirmi masa keçirilib. Tədbirdə ilk olaraq Azərbaycan Xalq Cümhuriyyəti liderlərinin xatirələri bir dəqiqəlik sükutla yad edilib.***



Tədbiri giriş sözü ilə açan ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev bildirib ki, may ayının 28-də Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 97-ci ildönümü tamam olur. Müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, ulu öndərimiz Heydər Əliyev demişdir: “Azərbaycan Xalq Cümhuriyyəti az yaşasa da, xalqımızın azadlıq, müstəqillik fikirlərini daha da gücləndirmiş oldu”. Qeyd edək ki, Abbasqulu ağa Bakıxanov, Mirzə Fətəli Axundzadə, Həsən bəy Zərdabi, Cəlil Məmmədquluzadə və digər görkəmli mütəfəkkir şəxsiyyətlərimizin irəli sürdükləri mütərəqqi ideyalar XIX əsrin sonları, XX əsrin əvvəllərində xalqımızın milli oyanışında və milli özünüdərkində mühüm rol oynamışdır. Eyni zamanda XX əsrin əvvəllərində cərəyan edən ictimai-siyasi proseslər də xalqımızın milli şüurunun oyanmasına güclü təkan vermişdir. Rusiyada çarizmin devrilməsi, baş verən fevral və oktyabr çevrilişləri, Birinci Dünya müharibəsinin nəticələri, ermənilərin zaman-zaman xalqımıza qarşı öz havadarlarının köməyi ilə törətdikləri deportasiya və soyqırımları və digər amillər Azərbaycanın müstəqil bir dövlət kimi yaşamasını həyatı bir zəruriyyət kimi qarşıya qoymuşdu. Bunu yaxşı anlayan xalqımızın vətənpərvər və millətsevər övladlarının təşəbbüsü, fəal iştirakı və rəhbərliyi ilə 1918-ci il may ayının 28-də Tbilisidə Azərbaycan Milli Şurası «İstiqlal Bəyannaməsi»ni qəbul etdi. 24 səslə qəbul edilən və 6 bənddən ibarət olan Bəyannamə Azərbaycan xalqının varlığını bütün dünyaya yaydı. Hüquqi və siyasi sənəd olan Bəyannamədə müstəqil Azərbaycan dövlətinin yarandığı göstərilmiş, onun hakimiyyətinin əhatə etdiyi ərazinin hüdudları müəyyənləşdirilmiş və dövlətin əsas prinsipləri öz əksini tapmışdır. «İstiqlal Bəyannaməsi»ndə demokratik dövlətin əsas atributları sayılan hakimiyyətin xalqa məxsus olması, vətəndaşların mülki və siyasi hüquqlarının təminatı, bütün xalqların və hər bir kəsin milli, dini və cinsi mənsubiyyətindən asılı olmayaraq, azad inkişafı üçün şəraitin yaradılması, həmçinin hakimiyyətin bölünməsi prinsipləri hüquqi cəhətdən təsbit edilmişdi.

Professor F.Rzayev qeyd edib ki, Azərbaycan Xalq Cümhuriyyətinin liderləri yeni yaradılmış müstəqil dövlətimizin beynəlxalq aləmdə tanınması üçün ciddi diplomatik iş aparmışlar. Belə ki, 1920-ci il yanvarın 11-də Paris sülh konfransında Azərbaycanın dövlət müstəqilliyi



de-fakto tanınmışdır. Azərbaycanın de-fakto tanımasına qədər xalqımız qısa bir müddət ərzində dövlət aparatı yaradaraq 20-dən çox dövlətlə-Türkiyə, Gürcüstan, ABŞ, İngiltərə, Fransa, İtaliya, İsveçrə və digər dövlətlərlə baş konsulluq, konsul agentlikləri səviyyəsində əlaqələr qura bilmişdi. Qədirbilən xalqımız Cümhuriyyət liderlərinin xatirəsini əziz tutur. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2013-cü il fevral ayının 25-də Əlimərdan bəy Topçubaşovun 150 illik yubileyinin, həmin ilin noyabr ayının 22-də isə Məhəmməd Əmin Rəsulzadənin 130 illik yubileyinin keçirilməsi haqqında sərəncamlar imzalamışdır. Hər il ölkəmizdə Azərbaycan Xalq Cümhuriyyətinin yaradılması ilə bağlı müxtəlif tədbirlər keçirilir. Dövlət başçımız İlham Əliyev 28 May-Respublika Günü münasibətilə Azərbaycan Xalq Cümhuriyyətinin şərəfinə paytaxtın İstiqlaliyyət küçəsində ucaldılmış abidəni ziyarət edərək önünə əklil qoyur. Bugünkü müstəqil və güclü, hərtərəfli inkişaf etmiş Azərbaycan Respublikası məhz Azərbaycan Xalq Cümhuriyyətinin siyasi varisidir.

Tədbirdə Ümumi tarix kafedrasının dosenti Səmayə Mustafayeva “28 May-Respublika Günü” mövzusunda məruzə ilə çıxış edib. Dosent S.Mustafayeva bildirib ki, Azərbaycan Xalq Cümhuriyyətinin yaradılması və onun 23 aylıq hakimiyyəti dövrü xalqımızın milli tarixi üçün mühüm əhəmiyyət kəsb edir. Cümhuriyyətin yaranmasından bir müddət öncə - 1918-ci ilin mart ayının 31-də azərbaycanlıların soyqırımı baş vermişdi. 1918-ci ilin qanlı 31 mart hadisələri may ayının 28-də Azərbaycan Xalq Cümhuriyyətinin elan edilməsinə təkan verdi. Azərbaycan Xalq Cümhuriyyəti çox ağır və mürəkkəb bir tarixi-siyasi şəraitdə fəaliyyət göstərmişdir. Bəzi xarici dövlətlərin Azərbaycanın müstəqil dövlət kimi yaşamasına imkan verməK istəməmələri, xüsusilə də erməni silahlı dəstələrinin Qarabağda və Zəngəzurda yaratdığı qarşıdurmalar, onların xalqımıza qarşı törətdikləri vəhşiliklər, həmçinin parlament və hökumət daxilində hökm sürən hərc-mərclik Azərbaycan Xalq Cümhuriyyətinin normal fəaliyyət göstərməsinə ciddi mənfi təsir göstərirdi. Lakin buna baxmayaraq, Azərbaycan Xalq Cümhuriyyəti öz dövlətçilik atributlarını qəbul etmiş, dövlət və hərbi quruculuq, iqtisadiyyat və mədəniyyət, təhsil və səhiyyə sahələrində mühüm əhəmiyyət kəsb edən ciddi addımlar atmışdır. 1918-ci il iyunun 27-də Azərbaycan dilinin dövlət dili elan edilməsi haqqında fərman imzalandı, iyunun 24-də üzərində ağ rəngli aypara və səkkizguşəli ulduz təsviri olan qırmızı bayraq dövlət bayrağı kimi qəbul edildi, noyabrın 9-da isə həmin bayraq üçrəngli - yaşıl, qırmızı və mavi zolaqlardan ibarət olan bayraqla əvəz edildi. 1919-cu ilə kimi Milli Ordunun yaradılması məqsədilə hökumət tərəfindən lazımi addımlar atıldı. Yaradılmış 40 min nəfərlik nizami ordunun 30 mini piyada, 10 mini isə süvari qoşun hissələrindən ibarət idi.

Cümhuriyyət dövründə xalq maarifi sahəsində də bir sıra tədbirlər həyata keçirilmişdir. 1919-cu il sentyabrın 1-də bugünkü Bakı Dövlət Universitetinin təsis olunması haqqında qanun, Kənd Təsərrüfatı İnstitutunun (indiki Azərbaycan Dövlət Aqrar Universitetinin), Bakıda Ali Əkinçilik Məktəbinin yaradılması haqqında qərar qəbul edilmiş, həmçinin Bakıda, Şəkidə, Gəncədə və Şuşada Müəllimlər Seminariyası açılmış, Salyanda, Qusarda, Zaqatalada müəllim hazırlayan kurslar təşkil edilmişdir.

Dosent S.Mustafayeva çıxışına davam edərək bildirib ki, bu dövrdə Sovet Rusiyası nəinki Azərbaycanın müstəqilliyinə münasibət bildirməkdən imtina edir, həm də ölkəmizə hərbi müdaxilə üçün siyasi-hərbi zəmin hazırlayırdı. Vəziyyəti gərginləşdirən başqa bir amil də bolşeviklərin Azərbaycan daxilindəki təxribatçılıq fəaliyyəti idi. Bolşeviklər həm də Ermənistanın Azərbaycana qarşı olan düşmən münasibətindən istifadə edirdilər. Beləliklə, 1920-ci ilin aprelində Denikin qoşunlarını məğlub edən XI Ordu Azərbaycan sərhədlərinə yaxınlaşdı. Mikoyan başda olmaqla bolşeviklər XI Ordunu Bakıya çağırdılar. Aprelin 26-dan 27-nə keçən gecə XI Ordu hissələri Azərbaycan ərazisinə daxil olub, Bakıya doğru irəliləməyə başladı. Bu zaman Azərbaycan Ordusunun demək olar ki, hamısı Qarabağda ermənilərə qarşı döyüşürdü, ölkənin şimal sərhədləri isə müdafiəsiz qalmışdı. Yalnız sərhəd qüvvələrindən ibarət azsaylı Azərbaycan Ordu hissələri isə düşmənə müqavimət göstərə bilmədi. Nəticədə, Azərbaycan Xalq Cümhuriyyəti daxili siyasi çəkişmələr, mürəkkəb beynəlxalq siyasi vəziyyət və xarici hərbi müdaxilə üzündən süquta uğradı. Yalnız 70 il keçdikdən sonra, yəni 1991-ci il oktyabr ayının 18-də xalqımız yenidən öz dövlət müstəqilliyini bərpa etdi. Ulu öndər Heydər Əliyevin 1993-cü ilin iyun ayının 15-də yenidən respublikamızda hakimiyyətə qayıtması ilə Azərbaycanın dövlət müstəqilliyi dönməz və sarsılmaz xarakter aldı. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bu gün Ulu Öndərin müdrük siyasi kursunu uğurla davam etdirərək ölkəmizi daha da gücləndirir, dinamik inkişafını təmin edir, onun beynəlxalq siyasi nüfuzunu artırır.

Dəyirmi masada çıxış edən Filologiya fakültəsinin Müasir Azərbaycan dili kafedrasının doktorantı Sahilə İbrahimova Azərbaycan Xalq Cümhuriyyətini tariximizin şanlı və böyük qürur doğuran səhifəsi kimi səciyyələndirib, onun dövlətçiliyimizin əsaslarının zənginləşməsində mühüm rolu olduğunu qeyd edib. S.İbrahimova eyni zamanda Azərbaycan Xalq Cümhuriyyətinin siyasi varisi olan bugünkü müstəqil və müasir Azərbaycanın həyatımızın bütün sahələrində sürətlə inkişaf etməsindən, eləcə də beynəlxalq siyasi nüfuzunun durmadan yüksəlməsindən qürur duyduğunu ifadə edib.

**Gülnar SÜLEYMANOVA**

# “Media və təhsil dialoqu: peşəkarlığın inkişafı” mövzusunda təlim-konfrans keçirilib

**May ayının 19-da Təhsil Nazirliyinin (TN) təşəbbüsü ilə Azərbaycan Universitetində ”Bakı-2015” I Avropa Oyunlarının təbliğinə həsr olunmuş “Media və təhsil dialoqu: peşəkarlığın inkişafı” mövzusunda təlim-konfrans keçirilib.**



Təlim-konfransda TN-nin əməkdaşları, media qurumlarının və ali təhsil müəssisələrinin mətbuat xidmətlərinin rəhbərləri, təhsillə bağlı qeyri-hökumət təşkilatlarının nümayəndələri, jurnalistika fakültəsinin tələbələri iştirak ediblər.

Konfransda media və təhsil əlaqələri, təhsilin keyfiyyəti və kütləvi informasiya vasitələri, ictimaiyyətlə əlaqələr (PR) üzrə peşəkar vərdişlərin yaradılması ilə bağlı təqdimatlar dinlənilib və təlimlər keçirilib. İştirakçılar informasiya kampaniyaların keçirilməsi, press-relizlərin yazılması, sosial qruplarla iş və digər mövzularda bilik və bacarıqlarını artırıblar.

Azərbaycan Dövlət İnformasiya Agentliyinin, (AZƏRTAC), ”Azad Azərbaycan” Televiziyasının və ”APA-Holdinq”in informasiya dəstəyi ilə təşkil olunmuş konfransda media və təhsil dialoqunun daha da yaxşılaşdırılması ilə bağlı müzakirələr aparılıb, müvafiq təklif və tövsiyələr səsləndirilib.

Tədbirdə çıxış edən Azərbaycan Universitetinin rektoru Fərid Əhmədov belə konfransların keçirilməsinin təhsil-media dialoqunda mühüm əhəmiyyət kəsb etdiyini deyib. “Azad Azərbaycan” Televiziyasının prezidenti Vüqar Qaradağlı təhsil-media dialoqu sahəsində mövcud vəziyyət barədə danışıb.

Sonra təhsil eksperti, professor Şahlar Əsgərov, Təhsil Şurasının sədri, professor Əjdər Ağayev çıxış edərək təhsil-media sahəsində belə konfransların keçirilməsinin mühüm əhəmiyyətini qeyd ediblər. Onların fikrincə, media təlim-tərbiyədə mühüm rol oynayır və bu prosesin dialoq çərçivəsində öyrənilməsi vacib məsələdir.

Tədbirin davamında ”APA-Holdinq”in prezident Vüsalə Mahirqızının, TN-nin İnformasiya şöbəsinin ictimaiyyətlə əlaqələr sahəsində institusional inkişaf üzrə koordinatoru Elçin Sərdarovun, Bakı Dövlət Universitetinin Jurnalistika fakültəsinin Radio və televiziya kafedrasının müdiri, dosent Aynur Kərimovanın, PR üzrə ekspert Aynur Rəşidovanın məruzələri dinlənilib.

Təlim-konfransda uğur qazanmış iştirakçılara sertifikatlar verilib.

Günün ikinci yarısında təlim-konfrans iştirakçılarının ”Bakı-2015” I Avropa Oyunlarının Milli Gimnastika Arenasına və Mətbuat Kəndinə səfəri təşkil olunub.

Qeyd edək ki, bu təlim-konfrans TN-nin “Media və təhsil dialoqu” çərçivəsində keçirdiyi sayca üçüncü konfransdır.

**Gülnar BƏXTİYARQIZI**



## ADPU-da "Hədəf Bakıdır. Hitler neft uğrunda döyüşü necə uduzdu" adlı sənədli filmə baxış keçirilib

May ayının 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) universitet rəhbərliyinin, professor-müəllim heyətinin və tələbə kollektivinin geniş iştirakı ilə Heydər Əliyev Fondunun dəstəyi ilə və Arzu xanım Əliyevanın layihəsi əsasında dünya şöhrətli Fransa prodüseri Lois Vaudevillenin "Hədəf Bakıdır. Hitler neft uğrunda döyüşü necə uduzdu" sənədli filminə baxış keçirilib. Qeyd edək ki, 52 dəqiqəlik bu film bütövlükdə Azərbaycanın İkinci Dünya müharibəsindəki tarixi roluna həsr olunub. Məlumat üçün onu da qeyd edək ki, "Hədəf Bakıdır. Hitler neft uğrunda döyüşü necə uduzdu" filmi dünyanın müxtəlif ölkələrinin arxivlərində qorunan sənədlərdən və tarixi xronikadan istifadə edilməklə ərsəyə gəlib və 10 xarici dilə tərcümə edilib. Adıçəkilən film Azərbaycanın faşizm üzərində Qələbəyə verdiyi böyük töhfəni özündə dolğun əks etdirir. Ölkə ictimaiyyəti arasında geniş əks-səda doğurmuş bu sənədli filmin yaxın gələcəkdə dünyanın qabaqcıl televiziya kanallarında da nümayiş etdirilməsi nəzərdə tutulur. Təqdirəlayiq haldır ki, yaradıcı heyətin təşəbbüsü ilə sözügedən film daha çox Azərbaycan gəncləri üçün nümayiş etdirilir. Çünki bu film gənclərimizin tarixi həqiqətləri dərindən öyrənmələrinə kömək etməklə yanaşı, onların milli vətənpərvərlik ruhunda tərbiyə edilməsinə müsbət təsir göstərir. Xüsusi qeyd edək ki, gənclər və pedaqoji heyət filmin Azərbaycanın və paytaxtımızın tanıdılmasında, təbliğində, faşizm üzərində Qələbədə böyük rolunun olmasının dünya ictimaiyyətinə çatdırılmasında əhəmiyyətini qeyd edərək onun yaradıcılarına və bu işdə zəhməti olan hər kəsə minnətdarlıqlarını bildirmişlər.

**Gülnar BƏXTİYARQIZI**

## Dosent Həcər Hüseynova Türkiyədə kitab təqdimatında iştirak edib

ADPU-nun Filologiya fakültəsinin Azərbaycan dilçiliyi kafedrasının dosenti, filologiya üzrə elmlər doktoru, AYB-nin üzvü Həcər Hüseynova 1-3 may 2015-ci il tarixlərində Türkiyə Respublikasının Çanaqqala şəhərində keçirilmiş "100 yılında 100 kalemlə-Atatürk və Çanakkale şiirleri" kitabının təqdimat mərasimində iştirak edib.

Qeyd edək ki, Türkiyə, Azərbaycan, Almaniya, Dağıstan, Çeçenistan şairlərinin əsərlərindən ibarət bu antologiyada Həcər Hüseynovanın "Türk əsgəri", "Türk əsgərlərinə müraciət" şeirləri də yer alıb.

Küsader Dərnəyinin başqanı Gilseren Akdaşın rəhbərliyi və Azərbaycan təmsilçiləri İlqar Türkoğlu, Raifə Sərxanqızının təşkilatçılığı, həmçinin Türkiyənin tanınmış elm, mədəniyyət xadimləri, iş adamları və yazarları Vural Şahin, Savaş Unal, Mehmet Ali Demircan, Ali Tekintüre, Yalçın Benlican, Cansın Erol, Sibel U.Özdemir, Hakan Yılmaz, Vadullah Taş, Consa Aydemirin iştirakı ilə Çanaqqala şəhərinin Mədəniyyət Mərkəzində konfrans və kitabın təqdimat mərasimi keçirilib. Konfransda "100 yılında 100 kalemlə-Atatürk ve Çanakkale şiirleri" kitabında şeirləri dərc olunan şairlər, yazarlar və mədəniyyət adamları çıxış ediblər. Küsader başqanı Gülseren Akdaş şairlərə xüsusi təşəkkürünü bildirib, qaliblərə mükafatlar və diplomlar təqdim edilib.




Sonra iştirakçılar Çanaqqala şəhidliyini, Anıt məzarı ziyarət etmiş, azərbaycanlı şəhidlərin məzalarına gül dəstələri və Azərbaycan bayrağı qoyublar.

**Mətbuat və informasiya şöbəsi**

## Dosent Rahib Abasov beynəlxalq simpoziumda iştirak edib

ADPU-nun Funksiyalar nəzəriyyəsi kafedrasının dosenti, Rusiya Təbiətşünaslıq Akademiyasının (RTA) professoru Rahib Abasov 20-22 may 2015-ci il tarixində Qazaxıstan Respublikasının Almatı şəhərində keçirilmiş "Türk dünyasının tədqiqi üzrə II Beynəlxalq Simpozium"da iştirak etmişdir. Bu beynəlxalq simpozium Almatı şəhərində yerləşən Qazaxıstan Dövlət Qadınlar Pedaqoji Universitetində keçirilmişdir. Simpoziumda 18 ölkədən 500-ə yaxın nümayəndə iştirak etmişdir. Simpoziumda müasir Türk dünyasının elm və təhsil sahələri üçün aktual olan müasir türkologiyanın inkişaf istiqamətləri və perspektivləri, müasir şəraitdə kadrlar hazırlığı: cəmiyyətin inteqrasiyası, universitetlər, elm, təhsil, Qazax xanlarının tarixi və onun "Mənqilik el" anlayışı ilə əlaqəsi, Türk filologiyasının aktual problemləri, Türkdilli cəmiyyətlərin tarixi və mədəniyyəti, Türk dünyası ölkələrində təbiətşünaslıq elmləri, müasir ali məktəblərdə milli və beynəlxalq təhsilin inkişaf istiqamətləri, həmçinin Türk dünyası ölkələrində gender və əlifba problemi üzrə məruzələr dinlənilmişdir.



Dosent R.Abasov bu simpoziumda rus dilində "İnteres uçahixsə k issledovatelğskoy rabote - zaloq uspexa v obuçenii"("Şagirdlərin tədqiqat işlərinə marağı təlimdə uğurların təminatçısıdır") mövzusunda məruzə ilə çıxış etmişdir. Qeyd edək ki, bu məruzədə Şərq müdrikliyinə və milli folklora aid müəyyən müddəaların orta və ali riyaziyyatın uyğun faktlarının tədrisində nəzərə alınmasının səbəb ola biləcəyi tərbiyəvi keyfiyyətlərdən söhbət açılır və misallar göstərilir. Həmçinin bu məruzədə şagird və tələbələrin zəngin məlumatlarla əhatə olunduğu müasir dövrümüzdə klassik metodik mülahizələrin daha çox elmi yeniliklər tərəfinin gücləndirilməsinin vacib olduğu önə çəkilmiş, bu istiqamətlərdə də konkret misallar göstərilmişdir.

Dosent R.Abasovun adıçəkilən məruzəsi simpozium iştirakçıları tərəfindən maraqla qarşılanmış və bu təcrübənin Türk dünyası ölkələrinin tədrisində geniş şəkildə nəzərə alınması tövsiyə olunmuşdur. Eyni zamanda yaradıcı yanaşma əsasında hazırlanmış bu məruzədə yetişməkdə olan nəslin təlim və tərbiyəsi üçün vacib olan kreativ ideyaların, müdrük məsləhətlərin irəli sürülməsi də diqqəti xüsusi cəlb etmişdir. Bunu həmin universitetin rəhbərliyinin ADPU-nun rəhbərliyinə ünvanlandığı təşəkkür məktubu da sübut edir. Həmin təşəkkür məktubunda dosent R.Abasovun məruzəsində irəli sürülən ideyaların yaxın gələcəkdə həyata keçəcəyi və dünya məkanında təhsilin keyfiyyətinə müsbət təsir göstərəcəyi inamı da öz əksini tapmışdır.

**Könül NƏRİMANQIZI**

## Abdulla Oruc oğlu Mehrabov

**Azərbaycan elm və təhsil ictimaiyyətinə ağır itki üz vermişdir. Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) «Pedaqoji təhsilin problemləri» elmi-tədqiqat laboratoriyasının müdiri, Rusiya Təhsil Akademiyasının həqiqi üzvü, texnika elmləri doktoru, professor, Əməkdar müəllim Abdulla Oruc oğlu Mehrabov may ayının 29-da ömrünün 77-ci ilində vəfat etmişdir.**



Abdulla Oruc oğlu Mehrabov 1938-ci ilin mayın 1-də Gürcüstanın Bolnisi rayonunun Saraclı kəndində anadan olmuşdur. 1957-ci ildə orta məktəbi qızıl medalla bitirdikdən sonra Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) Fizika fakültəsinə daxil olmuş, 1962-ci ildə fizika və istehsalatın əsasları ixtisasını fərqlənmə diplomu ilə bitirmişdir. Əvvəlcə ADPU-da istehsalatın əsasları kafedrasında tədris ustası vəzifəsində çalışmış, 1963-cü ildə Azərbaycan Politexnik İnstitutunun fizika kafedrasında müəllimlik fəaliyyətinə başlamışdır. Həmin ildə elmi staj keçmək məqsədi ilə Leninqrad Dəqiq Mexanika və Optika İnstitutunun İstilik fizikası kafedrasına göndərilmiş və bərk cisimlərin istilik xassələrinin öyrənilməsi ilə bağlı tədqiqatlar aparmışdır.

1964-1967-ci illərdə Bərk cisimlər fizikası ixtisası üzrə aspiranturanın əyani şöbəsində təhsil almış, vaxtından xeyli əvvəl «Qurğuşun-manqan ərintilərinin fiziki xassələrinin tədqiqi» mövzusunda dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi almışdır. 1967-1975-ci illərdə A.Mehrabov Azərbaycan Politexnik İnstitutunun Fizika kafedrasında assistent, baş müəllim, Fizika kafedrasının müdiri vəzifələrində işləmişdir. Azərbaycan Politexnik İnstitutunun bazasında Azərbaycan İnşaat Mühəndisləri İnstitutu yaradıldıqda isə bu institutun Fizika kafedrasına rəhbərlik etmişdir. 1983-cü ildə «Mürəkkəb həndəsi formalı konstruksiyalarda istilik ötürülməsinin problemləri» mövzusunda doktorluq dissertasiyasını müdafiə edərək texnika elmləri doktoru alimlik dərəcəsi almışdır. 1984-cü ildən professor idi.

A.Mehrabov 1989-1992-ci illərdə Azərbaycan Respublikasının xalq təhsili nazirinin müavini vəzifəsində işləmişdir. O, 1992-2000-ci illərdə Azərbaycan İnşaat Mühəndisləri Universitetində rektor əvəzi, birinci prorektor - tədris-tərbiyə işləri üzrə prorektor vəzifəsində çalışmışdır. 1997-2000-ci illərdə Təhsil Nazirliyinin nəzdində fəaliyyət göstərən Tədrisin təşkili və idarəolunması Elmi-Metodik Şurasının üzvü olmuşdur. 2001-2013-cü illərdə Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun direktoru, 2013-cü ildən ömrünün sonunadək ADPU-nun «Pedaqoji təhsilin problemləri» elmi-tədqiqat laboratoriyasının müdiri vəzifələrində fəaliyyət göstərmişdir.

Professor A.Mehrabov bərk cisimlər fizikası, bərk cisimlərin radiasiya fizikası, istilik fizikası və molekulyar fizika və təhsil tədqiqatları sahəsində tanınmış alim idi. Professor A.Mehrabov 500-dən çox məqalənin, 56-elmi-metodik vəsaitin, 13 dərslik və dərs vəsaitinin, 14 monoqrafiya və kitabın, 15 ixtiranın müəllifi olmuşdur. Onun elmi rəhbərliyi və elmi məsləhətçiliyi ilə 40-dan çox elmlər və fəlsəfə doktoru hazırlanmışdır.

O, ilk dəfə bərk cisimlərin, mayelərin istilik xassələrinin yüksək temperatur və təzyiqlərdə tədqiq etmək üçün yeni dinamik üsulların elmi əsaslarını, həmçinin mürəkkəb həndəsi formalı sistemlərdə (konstruksiyalarda) istiliyin paylanmasının tədqiqi üçün yeni metodların nəzəri və təcrübi əsaslarını işləyib hazırlamış və bu sahədə fundamental tədqiqatlar aparmışdır. Bərk cisimlər fizikası sahəsindəki uğurlar, yüksək enerjili hissəciklərin və radiasiyanın dəmir və nikel əsaslı ərintilərin kristallik quruluşuna, fəza keçidlərinə, fiziki, mexaniki və istilik xassələrinə təsirini araşdıraraq gəldiyi nəticələr ona böyük şöhrət qazandırmışdır.

Onun «Mürəkkəb həndəsi formalı sistemlərdə istiliyin paylanması» monoqrafiyası (rus dilində) aparıcı ölkə alimləri tərəfindən yüksək qiymətləndirilmiş və müxtəlif dillərə tərcümə edilmişdir. A.Mehrabov «Fizika kursu», «Ümumi fizika kursu üzrə laboratoriya praktikumu», «Ümumi fizika kursu», «Fizika praktikumu: mexanika, molekulyar fizika, elektrik, maqnetizm», «Termodinamika və istilik texnikasının əsasları», «Fizika» dərs vəsaitlərinin müəllifi, ümumtəhsil məktəblərinin XI sinifləri üçün «Fizika» dərsliyinin həmmüəlliflərindən biri olmuşdur.

Professor A.Mehrabovun elmi və əmək fəaliyyətinin ikinci dövrü Təhsil Problemləri İnstitutu ilə bağlı olmuşdur. A.Mehrabov bu institutda çalışdığı vaxtdan etibarən onun tədqiqatları yeni istiqamət almışdır. A.Mehrabov müəllim təhsilinin aktual problemləri, tədris-təlim-tərbiyə prosesinin monitorinq və qiymətləndirilməsi, təhsil sisteminin idarə olunması, innovasiyalar və pedaqoji texnologiyaların tətbiqi ilə bağlı sistemli tədqiqatlar aparmış, «Təhsil sistemində monitorinq və qiymətləndirmə», «Testologiya və müasir təhsil», «Təhsil marketinqinin əsasları», «Şagird intellektinin inkişafı», «Pedaqoji texnologiyalar», «Azərbaycan təhsilinin müasir problemləri», «Müasir təhsilin konseptual problemləri», «Müasir təhsilin metodoloji problemləri» adlı monoqrafiyaların nəşrinə nail olmuşdur.

Bu monoqrafiyalarda müasir təhsil, onun mahiyyəti və əsas prinsipləri, qloballaşma və Azərbaycan təhsil sisteminin modernləşdirilməsi, təhsilin fundamentallığı, şəxsiyyətyönümlü və nəticəyönümlü təhsilin qurulması, təhsil sistemində konseptual modellər və pedaqoji konstruktivizm, təhsildə səriştəli yanaşmanın mahiyyəti və məzmunu, təhsil sistemində marketinq xidməti, təlim prosesinin səmərəliliyinin yüksəldilməsinədə onun rolu, profilli təlim və seçmə kurslar, çoxprofilli ümumtəhsil məktəb layihəsinin modeli, XXI əsrdə təhsilin inkişafının əsas prioritetləri, Azərbaycan təhsil sisteminin inkişafının əsas istiqamətləri, təhsil sisteminin idarə olunmasının müasir problemləri öz elmi-pedaqoji həllini tapmışdır. A.Mehrabovun son dövrdə nəşr etdiyi monoqrafiyaları tədqiqatçı alimlər haqlı olaraq yeni dövrün pedaqogikası adlandırırlar.

Professor A.Mehrabov 1992-ci ildə Nyu-York Elmlər Akademiyasının (ABŞ) və Beynəlxalq Ekoenergetika Akademiyasının həqiqi üzvü seçilmişdir.

Elm və təhsil sahəsindəki uğurlarına görə «Tərəqqi medalı» (2005) ilə təltif olunmuş, Azərbaycan Respublikasının «Əməkdar müəllimi» fəxri adına (2006) layiq görülmüşdür.

İşlədiyi kollektivin və onu tanıyanların sevimlisi olan professor A.Mehrabov müəllimlik adını hər şeydən uca tutan, müəllimliyi ilə fəxr edən, işıqlı, nurlu və müsbət enerjili bir insan idi. O, səmimiyyəti, təvazökarlığı və digər insani keyfiyyətləri ilə seçilən, yüksək intellekt, zəngin əxlaq və fəzilət sahibi idi. Mədəniyyəti onun yaraşığı idi.

Görkəmli pedaqoq-alim Abdulla Mehrabovun əziz xatirəsi onu tanıyanların qəlbində daim yaşayacaqdır.

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorluğu, Pedaqoji fakültənin dekanlığı**

# İmtahan sessiyası obyektiv keçirildi

Məlum olduğu kimi, Azərbaycan Respublikasının Təhsil naziri cənab Mikayıl Cabbarov 2015-ci il aprel ayının 15-də "İmtahan sessiyasının təşkili və keçirilməsi barədə" müvafiq əmr imzalamışdır. Təhsil nazirinin həmin əmrində 2015-ci ildə Bakı şəhərində Birinci Avropa Oyunlarının keçirilməsi ilə əlaqədar Bakı şəhərində yerləşən ali təhsil müəssisələrində 2014-2015-ci tədris ilinin yaz semestrinin imtahan sessiyasının may ayının 11-də başlaması və mayın 31-də sona çatdırılması müəyyən edilmişdir. Eyni zamanda adıçəkilən əmrdə ali məktəblərdə yaz semestrinin imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin edilməsi, imtahan sessiyasının mövcud normativ sənədlər əsasında keçirilməsi, imtahanlara buraxılacaq tələbələrin siyahısının dəqiqləşdirilməsi, ali təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması və bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə araşdırılıb lazımi tədbir görülməsi, həmçinin imtahanlarda şəffaflığın təmin edilməsi üçün ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması öz əksini tapmışdır.

Təhsil nazirinin bu əmrindən irəli gələn vəzifələrin yerinə yetirilməsi üçün Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov aprel ayının 23-də 3/130 saylı əmr imzalamışdır. Rektor Y.Məmmədovun həmin əmrində Tədris-metodika şöbəsi, Magistratura və doktorantura şöbəsi, eləcə də fakültə dekanlıqları qarşısında ADPU-da builki tədris ilinin yaz semestrinin imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi qarşıya qoyulmuşdur. Eyni zamanda Tədris-metodika şöbəsinə, "İnformasiya-kommunikasiya texnologiyaları, monitorinq və qiymətləndirmə Mərkəzi"nə, həmçinin Magistratura və doktorantura şöbəsinə, fakültə dekanlıqlarına və kafedra müdirlərinə imtahanlara buraxılacaq tələbələrin siyahısının dəqiqləşdirərək rektorluğa təqdim edilməsi tapşırılmışdır. Rektor Y.Məmmədovun sözügedən əmrinə əsasən universitetdə 11 nəfərdən ibarət İmtahan qərargahı yaradılmışdır. İmtahan qərargahının sədri Mexanika və molekulyar fizika kafedrasının müdiri, professor Edil Eyvazov, müavini Funksiyalar nəzəriyyəsi kafedrasının müdiri, professor Rəhim Rzayev, katibi isə Analitik və fiziki kimya fakültəsinin dosenti Azər Sərdarlıdır. İmtahan qərargahının tərkibinə universitetin Elmi katibi, dosent Laçın Həsənova, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev, Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayev, Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müdiri, professor Əzizxan Tanrıverdiyev, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müdiri, dosent Rəcəb Əliyev, Əcnəbi tələbələrlə iş üzrə şöbənin müdiri, dosent Nurəddin Uluxanlı, Botanika kafedrasının müdiri, dosent Anaxanım Yusifova, Xarci dillər kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva daxil edilmişlər. Həmin əmrdə habelə imtahanlarda şəffaflığın təmin edilməsi üçün ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması, İmtahan qərargahının "İnformasiya-kommunikasiya texnologiyaları, monitorinq və qiymətləndirmə Mərkəzi" ilə birlikdə monitorinqlər keçirməsi, imtahanların təşkilində və gedişində mənfi hallara yol vermiş şəxslər barədə mövcud qanunvericiliyə uyğun tədbirlər görülməsi üçün rektorluğa təqdimat verməsi və digər məqamlar öz əksini tapmışdır.







Məlumat üçün bildirək ki, imtahan qərargahının fəaliyyət dairəsinə semestr dövründə imtahanların təşkili və keçirilməsinə nəzarət etmək, imtahanların təşkili və imtahan prosesi zamanı yarana biləcək mümkün mübahisəli vəziyyətlərlə bağlı daxil olmuş müraciətləri vaxtında araşdırıb müvafiq qərarlar qəbul etmək, akademik borcların ləğvində, həmçinin imtahanlarda tələbələrin biliyinin qiymətləndirilməsində obyektivliyi və şəffaflığı təmin etmək kimi mühüm məsələlər aiddir. İmtahandan aldığı qiymətlə razılaşmayan tələbələr fakültələr və universitet üzrə yaradılmış münaqişə komissiyalarına, həmçinin qərargaha müraciət edirlər. Qərargahın normal fəaliyyəti üçün ayrılmış iş otağına telefon xətti çəkilmiş, növbətçilik cədvəli yaradılmışdır. Qərargah üzvləri mütəmadi şəkildə imtahan zallarında olur, onlara ünvanlanan müraciət və təkilflərlə bağlı müvafiq qeydlər aparırlar. Bundan əlavə, universitetdə valideynlərlə əlaqələrin yaradılmasına da xüsusi diqqət yetirilir ki, bu da onlarda imtahanların gedişi barədə dolğun təsəvvürün formalaşdırılmasına xidmət edir. Qərargah üzvləri tərəfindən hər hansı müraciətin araşdırılması və qəbul olunmuş qərar qarşı tərəfi qane etmədikdə və ya müraciətlər komissiya üzvlərinin səlahiyyətlərinə aid olmadıqda rektorluğa müraciət edilir və narazı tərəfin iştirakı ilə məsələyə baxılır. İmtahan qərargahının əlaqə telefonları (012) 408-30-29 və (012) 498-17-94-dür.

İmtahan qərargahının rəhbəri, professor Edil Eyvazov və universitetin Kompüter Mərkəzində VTS - test sistemi üzrə keçirilən imtahanlarda nəzarət qrupunun rəhbəri, dosent Yaşar Hüseynəliyev bizə bildirdilər ki, universitetdə 5 kompüter imtahan zalı fəaliyyət göstərir. Həmin zallarda yerləşdirilmiş 200 kompüter vasitəsilə bir gündə təxminən 2000-dən çox tələbə imtahan verə bilir. İmtahanlara nəzarəti gücləndirmək üçün xüsusi kameralar quraşdırılmışdır. İmtahan zalında yanaşı oturan müxtəlif fakültələrin tələbələri ayrı-ayrı fənlərdən imtahan verirlər. Bu da onların bir-birinə kömək etmələrinin qarşısını alır. Eyni zamanda imtahanların keçirilməsinə nəzarəti təmin etmək məqsədilə imtahan rəhbərləri və nəzarətçi-müəllimlər təyin edilmişdır. Nəzarətçi-müəllimlər də qeyri-ixtisas sahibləridir. Bütün imtahan rəhbərləri və nəzarətçi-müəllimlər öz öhdələrinə düşən vəzifələri layiqincə yerinə yetirirlər. Kredit sistemi artıq özünü tam doğrultmuş, imtahanların test üsulu ilə, kompüter vasitəsilə aparılması tələbələrin böyük razılığına səbəb olmuşdur.

Kompüter Mərkəzində imtahanların gedişi ilə maraqlandıqda tələbə-gənclər bütövlükdə yaz semestrinin imtahan sessiyasının obyektiv və şəffaf keçirilməsindən birmənalı şəkildə razılıqlarını ifadə etdilər və ADPU-da yaradılan şəffaf təhsil mühitinə görə universitetin rektoru, professor Y.Məmmədova öz təşəkkürlərini bildirdilər.

Bu məlumatları əldə etdikdən sonra magistrantların imtahanlarının gedişi ilə də maraqlandıq. Məlumat üçün onu da qeyd edək ki, magistrantlar imtahan verdikləri fənlərdən sualları yazılı cavablandırdıqdan və imtahan üçün müəyyən edilmiş vaxt başa çatdıqdan sonra yazı işləri götürülüb kodlaşdırılır, ixtisas müəllimləri tərəfindən elə həmin gün yoxlanılıb dekanlığa məlumat verilir. Magistrantlar da öz növbələrində ADPU-da imtahan sessiyasının obyektiv keçirilməsindən razı qaldıqlarını bildirdilər. Biz isə tələbə-gənclərlə apardığımız söhbətdən və müşahidələrimizdən belə bir qənaətə gəldik ki, ADPU-da həyata keçirilən bütün bu tədbirlər imtahanların obyektiv və şəffaf keçirilməsinin təmin edilməsinə yönəlib.

Xüsusi qeyd etmək istəyirik ki, universitet daxilində, eləcə də tədris auditoriyalarında və imtahan zallarında yaradılmış nizam-intizam, səliqə-sahman da hamı tərəfindən razılıqla qarşılanır.

Bundan başqa, ADPU-nun mühafizə xidmətinin baş mühafizəçisi Şamil Cəfərzadə, mühafizəçilər Əfqan Rəhimov, Rəhman Aslanov, Nicat Niyazov və Elsevər Hacıyev universitetdə ictimai asayişin təmin edilməsi və daxili nizam-intizam qaydalarının lazımi səviyyədə qorunması üçün yüksək səviyyədə fəaliyyət göstərirlər.

**Mənsur QÜDRƏTOĞLU,**
**Gülnar BƏXTİYARQIZI**

# Əməkdaşımızın uğurları

23-24 aprel 2015-ci il tarixində Türkiyə Respublikasının Tekirdağ şəhərində "100-cü yıl anısına Uluslararası Çanakkale Savaşlarında Tekirdağ" adlı beynəlxalq simpozium keçirilmişdir. Həmin beynəlxalq simpoziumda Azərbaycan Dövlət Pedaqoji Universitetini (ADPU) "Türk araşdırmaları" elmi-tədqiqat mərkəzinin kiçik elmi işçisi Leyla Kərimova təmsil etmişdir. Leyla Kərimova bu beynəlxalq elmi toplantıda "Tekirdağın Çanakkale savaşlarında əhəmiyyəti və bu zəfərin Mehmet Akif Ersoy əsərlərində təzahürü" adlı məruzə ilə çıxış etmişdir. L.Kərimovanın çıxışı simpozium iştirakçıları tərəfindən bəyənilmiş və o, plaketlə təltif olunmuşdur.

Qeyd edək ki, əməkdaşımızın uğuru yalnız bununla bitmir. Belə ki, L.Kərimova Azərbaycan Yazıçılar Birliyi və Türkiyənin Azərbaycandakı Səfirliyinin birgə təşkilatçılığı ilə keçirilən Çanaqqala mövzusunda yazılmış hekayə müsabiqəsinin qalibi olmuş, diplomla təltif edilmişdir.






18-22 may 2015-ci il tarixində isə Türkiyənin Çanaqqala şəhərində Çanaqqala zəfərinin yüz illiyinə həsr olunmuş müsabiqə qaliblərinin iştirakı ilə müxtəlif tədbirlər həyata keçirilmişdir. 9 nəfərdən ibarət azərbaycanlı nümayəndə heyəti 5 gün ərzində Çanaqqala şəhərində müharibə zamanı həlak olan şəhidlərin məzarını ziyarət etmişdir. ADPU-nu həmin tədbirlərdə də L.Kərimova təmsil etmişdir. Tədbir zamanı qonaqlar dəniz və quru müharibələrinin baş verdiyi bütün cəbhələrlə tanış edilmiş, müharibə qəhrəmanlarının xatirəsinə ucaldılmış abidələr ziyarət edilmişdir. Eyni zamanda Çanaqqala döyüşünün baş verdiyi ərazilərdə olan muzeylərə baxış keçirilmiş, həmçinin qonaqlar Çanaqqala şəhərinin yaxınlığında yerləşən qədim tarixi ərazilərlə tanış edilmişdir.

**Könül NƏZƏROVA**

# TGT-nin VI hesabat-seçki konfransı keçirilib

May ayının 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) VI hesabat-seçki konfransı keçirilib. Hesabat-seçki konfransını giriş sözü ilə açan ADPU-nun əməkdaşı Elxan İsgəndərov TGT-nin yaranma tarixi haqqında tədbir iştirakçılarına məlumat verib. Tədbirdə çıxış edən TGT-nin sədri Sahil Qələndərov təşkilatın ötən dövr ərzindəki fəaliyyətinə dair hesabatı təqdim edib və hesabat yekdilliklə qəbul edilib.

Hesabat-seçki konfransında ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev, Gənclər və İdman Nazirliyinin, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının, Səbail Rayon Gənclər və İdman İdarəsinin nümayəndələri çıxış edərək ADPU TGT-nin ötən dövr ərzindəki fəaliyyətini yüksək qiymətləndiriblər. Sonra səsvermə yolu ilə TGT-nin yeni sədri və sədr müavinləri seçilib. TGT İdarə Heyətinin səs çoxluğu ilə Cavid Hüseynov TGT-nin yeni sədri, Xoşqədəm Həsənli, Mirzə Hacızadə, Aytac Fərzəliyeva və Məhəmməd İsrayilzadə isə yeni sədr müavinləri seçiliblər.

**Ramid Seyfullayev,**
**Pedaqogika və psixologiya fakültəsinin II kurs tələbəsi**

# Fundamental "Azərbaycan ədəbiyyatı tarixi " dərsliyi

Son dövrlərdə ədəbi-mədəni mühitimizdə müxtəlif istiqamətli araşdırmaların, təhlillərin bolluğu ilə qarşılaşırıq. Bu, müsbət haldır və həm ədəbiyyatımızın, həm də ədəbiyyatşünaslığımızın boy artımına xidmət edən uğurlu meyildir. Müasir ədəbi mühit bütün müstəvilərdə rəngarəngliklə, düşüncə tipləri, imza müxtəliflikləri ilə maraq doğurmaqdadır. Poeziyada, nəsrdə, dramaturgiyada, publisistikada olan canlanma Azərbaycanın müstəqilliyindən sonrakı dövrdə mərhələ səciyyəsi ilə seçilir və daha çox milli düşüncəyə, etnos təsəvvürlərinin, genetik yaddaşın açılışına hesablanır. Klassik ədəbiyyatın öyrənilməsi, bu yönümdə təhlillərin aparılması həmin zənginlikdə ayrıca bir istiqamətdir. Həm də digər sahələrdən, dövrlərdən fərqli olaraq ağır və böyük zəhmət, məsuliyyət tələb edən istiqamətdir. Məhz bu səbəblərə görə də klassik ədəbiyyatın öyrənilməsi, bu sahədə monoqrafik araşdırmaların aparılması sahəsində bir qədər kasadlıq nəzərə çarpır. Ancaq onu da etiraf edək ki, klassik ədəbiyyatımızın, ərəbdilli, farsdilli Azərbaycan poeziyasının öyrənilməsi istiqamətində olduqca ciddi və əhəmiyyətli işlər görülmüşdür və bu gün də görülməkdədir. Görülən işlərin məsuliyyəti, xidmətin şərəflə aparılması xətti sevindiricidir. Bizlərdən əvvəlki nəslin elm və qələm sahibləri gediləcək yolu müəyyənləşdiriblər. Bu istiqamətdə lazım olan ənənəni və elmi məktəbi yaradıblar. Bu gün də ədəbi-mədəni mühitdə həmin ənənənin lazımi qədər uğurlu nümayəndələri və nümunələri görünməkdədir. Anadilli poeziyanın orta əsrlər mərhələsinin tədqiqatları da bura daxildir.

Orta əsrlər Azərbaycan ədəbiyyatının istedadlı tədqiqatçısı, ədəbi-mədəni sferada lazımı qədər ciddi və orijinal söz sahibi, filologiya üzrə elmlər doktoru, professor Yaqub Babayevin elmi yaradıcılığı məhz bu baxımdan daha çox maraq doğurur. Alimin "Pedaqoji mühit və uşaq ədəbiyyatı" (M.Məmmədov, T.Cavadovla birlikdə, 1992), "Təriqət ədəbiyyatı: sufizm, hürufizm" (2011), "Anadilli Azərbaycan ədəbiyyatının təşəkkülü və epik şeirin inkişafı (XIII-XIV əsrlər)" (2008), "XIII-XIV əsrlər anadilli lirik şeirimizin inkişaf yolu" (2009) və s. kimi elmi kitabları onun ədəbiyyatşünaslığımızda yerini və nə qədər gərəkli işlər gördüyünü təsəvvür etməyə əsas verir.

Azərbaycanın müstəqilliyindən sonra ədəbi-mədəni və elmi mühitdə bir kitab bolluğu hökm sürməkdədir. Bu müsbət haldır, ancaq onun doğurduğu mənfi fəsadlar, kitab yazmanın məsuliyyəti və necə gəldi kitab xatirinə kitab çıxarmaq meyili bir qədər narahatlıqlar doğurur. Ədəbi tənqidin loyallığından, öz funksiyasını lazımi qədər yerinə yetirə bilməməsindən doğan bir məyusluq da hökm sürməkdədir. Nədənsə elə bir dövrə gəlib çıxmışıq ki, ədəbi tənqid hətta lazımi qədər gərəkli olanın, uğurlu araşdırmaların nümunəsinə çevrilən kitabların da dəyərini verməkdə gözləmə mövqeyi tutur. Təhlillərin böyük bir qismi şəxsi meyarlara, subyektiv münasibət səviyyəsinə dayanır. Ona görə də biz bir sıra məsələlərdə, elmi-nəzəri fikrin irəliyə doğru hərəkətində və yüksəlişində bir qədər gecikirik. Klassik ədəbiyyatın öyrənilməsində də bu hallar müşahidə olunur. Ancaq sevindirici odur ki, fərqli tendensiyalara baxmayaraq, ədəbiyyata lazımi qədər ciddi, məsuliyyətlə yanaşan, hər sözün, cümlənin, fikrin qədrini bilən, onun keşiyində dayanan cəfakeş bir nəsil də formalaşmaqdadır. Hətta mən deyərdim ki, formalaşmışdır. Ədəbiyyatşünaslıq elmimizin mövcud ağırlıq mərkəzi onların üzərindədir. Yaqub Babayev də məhz belə alimlərimizdəndir. Onun son dövrlərdə çıxan "Azərbaycan ədəbiyyatı tarixi (XIII-XVIII əsrlər)" (Bakı, "Elm və təhsil", 2014) dərsliyi bunun parlaq nümunəsidir. Deyəcəklərim də məhz daha çox bu dərsliklə bağlıdır.

Etiraf edək ki, son dövrlərdə ən çox mübahisə, söz-söhbət predmeti olan dərsliklərdir. Orta məktəb dərslikləri üzərində gedən mübahisələr, mətbuat səhifələrində, televiziya ekranlarında, İnternet saytlarında gedən yazışmalar, fikir ayrılıqları buna nümunədir. Bunun da köklü narazılıqlara gətirib çıxaran ciddi səbəbləri və tərəfləri vardır. Bu fikir ayrılıqları, mübahisələr, heç şübhəsiz ki, özlüyündə məsuliyyəti artırır. Daha yaxşı olanı, dərsliyin prinsiplərinə cavab verən kitabların yazılmasını aktuallaşdırır. Burada həm obyektiv, həm də subyektiv səbəblər və meyillər də özünü büruzə verə bilər. Bu səbəb və meyillərin mövcudluğunu da danmaq mümkün deyil. Ancaq bütün bunlara baxmayaraq dərslik yazmağın məsuliyyəti və gərəklilik səviyyəsi daha böyükdür. Dərslik yazmaq iddiasına düşən hər bir kəs ilk olaraq bunları nəzərə almalıdır. Bilməlidir ki, dərslik həm elmi, həm də pedaqoji problemdir. Onun uğurlu alınması müəllifin həm elmi, həm də pedaqoji-psixoloji hazırlığından asılıdır. Elmi tutumla yanaşı dərsliyin hansı auditoriyaya hesablandığının, ondan istifadə edənlərin yaş və fərdi xüsusiyyətlərinin, dərsliyin funksiyalarının və onun tərtibinə verilən pedaqoji-psixoloji, valeoloji tələblərin nəzərə alınması onun uzunömürlüyünü təmin edən əsas şərtlərdəndir. Dərsliyə daxil edilən hər bir bədii nümunə, mətləb, oçerk yüz ölçülüb, bir biçilməlidir.Həmin mətnin tələbələrdə hansı kompetensiyanı formalaşdıra biləcəyi öncədən bilinməlidir. Y.Babayevin pedaqoji təhsilli olması, pedaqogika və psixologiyanı yaxşı bilməsi, pedaqoji mətbuatımızı

*"Ey oğul! Bütün dünyanı elmlə, gözəlliklə dolu kuzə bil..."*

**Mövlana Cəlaləddin Rumi**

və klassik məktəb dərsliklərimizi dərindən araşdırması onun dərslik yazmaq kimi çox çətin və məsuliyyətli bir işdə uğur qazanmasının başlıca səbəblərindən olmuşdur. Doğrudur, bizim klassik ədəbiyyatla bağlı dərslik yaratmaq ənənəmiz olubdur. Sırf ədəbiyyata, xalqımızın övladlarının maariflənməsinə xidmət edən dərsliklərimiz vardır. Professor Y.Babayevin də dərsliyi məhz bu ənənəyə əsaslanaraq yazılmışdır.

Orta əsrlər Azərbaycan ədəbiyyatı tarixinin ən zəngin, həm də kifayət qədər orijinallıqlarla dolu olan məxsusi bir mərhələsidir. Bu mərhələdə bir-birindən böyük, istedadlı sənətkarlarımız olmuş və onlar bütün varlıqları ilə ədəbiyyata xidmət etmişlər. S.Z.Şirvani, H.Təbrizi, N.Tusi, M.Şəbustəri, İ.Həsənoğlu, M.Əvhədi, Ə.Təbrizi, F.Nəimi, İ.Nəsimi, A.Ərdəbili, Q.Bürhanəddin, Bəsiri, Süruri, Fəzli, B.Şirvani, Ş.Q.Ənvar, M.C.Həqiqi, Xəlili, Kişvəri, H.İsfahani, Ş.İ.Xətai, M.Füzuli, Fədai, M.Əmani, S.Təbrizi, Q.Təbrizi, N.Şirvani, Ş.Şirvani, M.Şirvani, M.V.Vidadi, M.P.Vaqif və digər sənətkarlar öz zamanlarında ədəbiyyata şərəflə xidmət etmiş, layiqli töhfələr vermişlər. Müasir ədəbiyyatımız məhz bu böyük sənətkarların ideallarına, amallarına xidmət etməklə həmin zənginliyi yaşatmaq, gələcəyə daşımaq yolunu tutmuşdur. Bu özlüyündə ən vacib, həm də alqışlanmalı məsələdir. İstedadlı ədəbiyyatşünas alimimiz Y.Babayev məhz bu böyük simaların həyat və yaradıcılıqlarını öyrənməklə həm də onların müqəddəs amallarını geniş elmi, pedaqoji ictimaiyyətə tanıtmaq vəzifəsini yerinə yetirir. O, eyni zamanda ədəbi ictimaiyyətimizə, geniş oxucu kütləsinə vaxtaşırı onlarla bağlı araşdırmalarını, təhlil-oçerklərini, elmi məqalələrini təqdim edir. Mətbuat səhifələrində bir-birindən maraqlı yazılarla çıxış edir. Yuxarıda adını çəkdiyimiz monoqrafiyalar uzun illərin araşdırmasının, zəngin və çoxsaylı materialların izlənilməsinin nəticəsidir.




Azərbaycan xalqının ictimai, siyasi, mədəni həyatında orta əsrlər ziddiyyətlər, feodal çəkişmələri, müharibələr, xarici və daxili gərginliklərlə dolu olan keşməkeşli bir dövrdür. Bu mərhələdə tiranlığın, fironluğun meydan suladığı da tarixin daş yaddaşından silinməmişdir. Belə bir zamanda bütün ziddiyyətlərə, gərginliklərə, qılınc toqquşmalarına cavab verəcək, onun qarşısında duruş gətirəcək ədəbiyyat vardır. Poeziya həmin mərhələdə bütün qələbələrin, milli yaddaşı qorumağın, etnos varlığının mühafizəsinin və gələcəyə gedişin, qurtuluşun enerji qaynağı idi. Həmin böyük sənətkarlar öz qələmlərinə sarılmaqla bir növ ideallarına sədaqət göstərmiş, geniş kütləni arxasınca aparmaq, milli etnos yaddaşına, milli mənsubluğa sahiblik missiyasını yerinə yetirmişlər. Bir növ öz əsərləri ilə şahlardan, tiranlardan fərqli olaraq xalqın həqiqi tarixini yazmışlar. Ona görə də klassiklərin yaradıcılığı milliliyin, mənəvi-əxlaqi dəyərlərin, genetik yaddaşın qorunuşu müstəvisində əvəzsiz mənbədir. Ədəbiyyatşünas Y.Babayev də öz mülahizələrini təkcə mətn müstəvisində poetik nitq aktları, janr tipləri kontekstində qurmur. Geniş ümumiləşdirmələr aparır, dövrün xülasəsini verməklə sənətkar və mühit məsələlərinə də diqqət yetirir.

Ümumiyyətlə, XIII-XVIII əsrlər Azərbaycan ədəbiyyatının ağırlıq mərkəzini özündə ehtiva edən ciddi bir mərhələdir. Burada İ.Nəsimi, Ş.İ.Xətai, M.Füzuli, S.Təbrizi, M.V.Vidadi, M.P.Vaqif kimi nəhənglər vardır. Onu da əlavə edək ki, bu sənətkarlar təkcə Azərbaycan ədəbiyyatı çərçivəsində deyil, dünya ədəbiyyatı miqyasında tanına bilən nəhəng ədəbi simalardır. Onların auditoriyada sistemli şəkildə tələbələrə öyrədilməsi, mühit səviyyəsində tipoloji araşdırmalarla təhlil olunmaları ən ümdə məsələlərdir.

Müasir dövr üçün başlıca və birinci dərəcəli məsələ obyektiv qiymətləndirmələrin aparılmasıdır. Son illərin ədəbi mühiti, demokratiya təsəvvürləri bəzən sərhədlərin aşılmasını, əndazələrin pozulmasını ortaya qoyur. Fakta, bədii nümunəyə, tarixi prosesə tendensiyalı, iddialı yanaşmalar çoxluq təşkil edir. Bu, ədəbiyyat adamlarına, sözün həqiqi mənasında ədəbiyyatla yaşayanlara, Y.Babayev kimi ciddi tədqiqatçılara aid edilə bilməz. Təəssüf ki, son dövrün orta məktəb dərsliklərində şedevrlərin, klassiklərin sıxışdırılması, bəzi təsadüfi ədəbi şəxsiyyətlərin dərsliklərə salınması hadisəsi özünü göstərməkdədir. Bu qorxulu, həm də təəssüflənməli tendensiyadır. Azərbaycan balalarına gərəkli olanı öyrətmək lazımdır. Bütün münasibətlərdən ucada xalq, milli mənafe, klassika dayanır. Məhz bu baxımdan Y.Babayevin dərsliyi son onilliklərin dərslikləri arasında ən uğurlu nümunədir.

Azərbaycan ədəbiyyatı müstəvisində dərslik yazmanın H.Araslı, F.Qasımzadə, P.Əfəndiyev, Ə.Səfərli, X.Yusifli, M.Cəlal, F.Hüseynov, P.Xəlilov, A.Hacıyev və s. kimi ədəbiyyatşünaslara məxsus ənənəsi vardır. Təkcə bir nümunəni misal çəkək ki, professor P.Əfəndiyevin "Azərbaycan şifahi xalq ədəbiyyatı" dərsliyi 45 ildir ki, tələbələrin, müəllimlərin stolüstü kitabıdır. Son dövrlərdə "Azərbaycan şifahi xalq ədəbiyyatı" adında bir neçə dərslik yazılmışdır. Lakin onların heç birisi auditoriyada özünə yer tapa bilməmişdir. Dərslik yazmaq iddiasında olan kəs gərək auditoriyanı və predmeti kifayət qədər bilsin. Nəyi və necə deməyi yaxşı anlasın.

Ədəbiyyatşünas Y.Babayev orta əsrlər ədəbiyyatının tədqiqatçısıdır. Mənbələrə, faktlara, sənətkarların həyat yoluna lazımı qədər bələddir. Ədəbi sahədə orta əsrlərin layiqli mütəxəssisi, o dövrün həqiqi söz sahibi kimi tanınmışdır. "Təriqət ədəbiyyatı: sufizm, hürufizm", "Anadilli Azərbaycan ədəbiyyatının təşəkkülü və epik şeirin inkişafı (XIII-XIV əsrlər)", "XIII-XIV əsrlər anadilli lirik şeirimizin inkişaf yolu" monoqrafiyaları klassik ədəbiyyatımızın tədqiqinə həsr olunmuş monumental tədqiqat əsərləridir. Bu kitabların hər birisi özlüyündə ciddi araşdırmaların, uzunmüddətli zəhmətin, mənbələri diqqətlə öyrənməyin nəticəsidir.

Məlum olduğu kimi, orta əsrlər Azərbaycan ədəbiyyatının mahiyyətində özül təşkil edəcək qaynaqlar və istiqamətlər vardır. Bunlardan biri və bəlkə də, birincisi ədəbiyyatda boy göstərən təriqət ideyalarıdır. Bir növ milli düşüncənin, mənəvi zənginliyin hadisəsi kimi böyük sənətkarlar təriqət ideyaları ilə xalqın, etnosun mənəvi dəyərlərini zənginləşdirmək, qoruyub gələcək nəsillərə çatdırmaq yolunu tutublar. Ədəbiyyat, daha doğrusu, orta əsrlərin poeziyası özlüyündə bu missiyanın, amalın daşıyıcısı funksiyasında çıxış etmişdir. Z.Şirvani, H.Təbrizi, N.Tusi, M.Şəbustəri, İ.Həsənoğlu, M.Əvhədi, Ə.Təbrizi, F.Nəimi, İ.Nəsimi, A.Ərdəbili, Q.Bürhanəddin, Bəsiri, Süruri, Fəzli, B.Şirvani, Ş.Q.Ənvar, M.C.Həqiqi, Xəlili, Kişvəri, H.İsfahani, Ş.İ.Xətai, M.Füzuli və digərlərinin yaradıcılığı bunun bariz nümunəsidir. Onu da etiraf edək ki, bu sənətkarlar təkcə Azərbaycan ədəbi məkanında tanınmış ədəbi şəxsiyyətlər deyillər. Bütünlükdə Şərq və dünya ədəbiyyatı xəzinəsinə öz töhfələrini vermiş, adlarını böyük ədəbiyyata yazdırmış simalardır. Y.Babayevin müasir ədəbi-nəzəri düşüncənin prinsipləri əsasında apardığı təhlillər özünün funksional xarakteri, filoloji təhlil mexanizmi ilə yeni və maraqlı görünür.

Bir məsələni xüsusi olaraq vurğulayaq ki, ədəbiyyatşünas alim, professor Y.Babayev Azərbaycan ədəbi-nəzəri fikrinin görkəmli nümayəndəsi professor M.Məmmədov məktəbinin yetirməsidir. Ondakı bir sıra keyfiyyətlər, ciddilik, məsuliyyət, hadisə və faktların dəqiqliklə öyrənilməsi, sinxron və diaxron müstəvidə ən kiçik məsələləri izləyib mahiyyətinə varmaq və s. hamısı həmin məktəbdən irəli gəlir.Onun elmə məhz ilk addımlarını görkəmli ədəbiyyatşünas M.Məmmədovun rəhbərliyi ilə atması sonrakı dövrlərdə öz töhfələrini verdi. Elmi və pedaqoji fəaliyyəti ciddilik, xeyirxahlıq və məsuliyyət üzərində qurulmuşdur. Məhz bu günlərdə nəşr olunan möhtəşəm "Azərbaycan ədəbiyyatı tarixi (XIII-XVIII əsrlər)" dərsliyi də bunun bariz nümunəsidir. Yeri gəlmişkən bir məsələni də qeyd edək ki, aspirant yoldaşım Y.Babayev zəngin, şərəfli, həm də olduqca maraqlı ömür yolu keçmişdir. O, 1958-ci ildə Gədəbəy rayonunun Dəyəqarabulaq kəndində anadan olmuş və həmin kənddə səkkizillik məktəbi bitirmişdir. Böyük Qarabulaq (indiki Miskinli) kəndində orta təhsil almışdır. Gəncə Dövlət Universitetində ali təhsilə yiyələnmişdır. 1985-1988-ci illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) aspiranturasında oxumuşdur. Elə sonrakı həyatı da ADPU ilə bağlı olmuşdur. İndi də bu ali məktəbdə fəaliyyət göstərir. Filologiya üzrə elmlər doktoru, professordur. İlk tədqiqatı XX əsr uşaq nəsri ilə bağlıdır. Bu xarakter və keyfiyyətlərin formalaşmasında onun boya-başa çatdığı Gədəbəyin əsrarəngiz təbiəti, dağların əzəməti, füsunkar gözəllikləri, heç şübhəsiz ki, müstəsna rol oynamışdır.

Ədəbiyyatşünas alim, professor Y.Babayevin yazdığı dərsliyin kifayət qədər uğurlu keyfiyyətləri vardır. Onu da etiraf edək ki, bu dərslik yoxdan yaranmamışdır. Y.Babayevə qədər görkəmli ədəbiyyatşünas alimlər Ə.Səfərli və X.Yusifli tərəfindən "Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı" adlı dərslik yazılmışdır. Bu gün də bu dərslikdən auditoriyalarda istifadə olunur. Belə olan tərzdə Y.Babayevin XIII-XVIII əsrlər Azərbaycan ədəbiyyatına aid dərslik yazması xeyli çətin idi. İlk anda belə təsəvvür yaranırdı ki, Y.Babayev burada təsirə, təkrarçılığa qapılacaqdır. Ancaq müəllifin auditoriyanı dərindən bilməsi, özünə qədərkilərdə nələrin çatışmadığnı həssas duyumla fəhm etməsi onu uğurlu bir dərslik yazmağa gətirib çıxarmışdır. Söhbətlərimizdə, mətbuat səhifələrində çıxan yazılarında da bu araşdırmaların son olaraq dərsliyə gəlib çıxacağını düşünürdüm. Təxminən keçən əsrin doxsanıncı illərindən mənbələri, arxiv materiallarını, yeni yazılan məqalə və monoqrafiyaları izləyən Yaqub müəllim auditoriya üçün zəruri olan faktların, şəxsiyyətlərin ədəbi və elmi-ictimai mühitə çatdırılması sahəsində də araşdırmalar aparırdı. Onun müxtəlif illərdə mətbuat orqanlarında çıxan məqalələri, portret oçerkləri, eləcə də anadilli ədəbiyyatın təşəkkülü ilə bağlı tədqiqatları ciddi marağa səbəb olurdu. Y.Babayevin dərsliyinin uğurunun bir istiqaməti də məhz bununla bağlıdır.

İkinci bir istiqamət yeni əlavələrlə, portret oçerklərlə dərsliyin zənginləşdirilməsidir. Y.Babayevin dərsliyi Rami Təbrizi, Şeyx Səfiəddin Ərdəbili, Nəsir Bakuvi, Əbdülqadir Marağayi, Hinduşah Naxçivani və Hüsaməddin Xoyi, Yusif Məddah, Salman Savəçi, Cahanmələk Xatın İncəvi, Sadəddin Həriri, Puriya Vəli, Nəsirəddin Tusi, Fəzli, Ruhi Bağdadi, Əfsəhəddin Hidayətullah, Əşrəf Marağayi, Şeyx Vəli Şirazi, Tərzi Əfşar, Təsir Təbrizi, Baba Şirvani, Şəkili Nəbi və s. sənətkarlar barədə gərəkli elmi məlumatları özündə ehtiva etməsi ilə də diqqəti cəlb edir.

Dərslikdə digər müsbət cəhət müəllifin sosioloji və ideoloji təhlillərdən imkan daxilində qaçmağa çalışmasıdır. Əlbəttə, yüzə-yüz sosioloji təhlillərdən yan keçmək mümkün də deyildir. Bunu etmək özü də son olaraq bir başqa istiqamətdə qüsur kimi görünərdi. Y.Babayev məhz təhlillərdə daha çox poetik mahiyyəti, mətn informasiyasını, sənətkarlıq məsələlərini açmağa və auditoriyaya çatdırmağa üstünlük vermişdir. Əslində, son dövrlərə qədər yaranan bütün dərsliklərdə sosioloji, ideoloji təhlillər üstünlük təşkil edirdi. Y.Babayev öz yeni dərsliyi ilə Sovet dönəmində müəyyənləşmiş bu ənənəvi prinsipləri pozmuş və daha uğurlu yol seçmişdir.

Ali məktəb auditoriyaları zaman-zaman yeni dərsliklərə, ayrı-ayrı problemlərin fərqli baxış müstəvisində təhlilinə ehtiyaclıdır. Azərbaycan ədəbiyyatının ən maraqlı mərhələsini təşkil edən orta əsrlər mərhələsi bu baxımdan mühüm əhəmiyyət kəsb edir. Çünki bu mərhələdə ərəbdilli, farsdilli və anadilli ədəbiyyatın özünəməxsus inkişaf tendensiyası, sufizm və hürufizm kimi təriqət cərəyanlarının özünəməxsus ideyalarının hakim olduğu ədəbi-məfkurəvi proses vardır. Təriqət ideyaları bu əsrlərdə ədəbiyyatın, ədəbi-mədəni mühitin canına, qanına hopmuşdu. Bütünlükdə Şərq düşüncə tərzi bu ideyalara yüklənmişdi. Onun Azərbaycan ədəbiyyatı müstəvisində təhlili, auditoriyaya gətirilməsi, ümumiyyətlə, təriqət görüşlərinin ədəbiyyatda hansı məqsədi daşıması və s. məsələlər son dövr dərslikləri üçün zəruri görünürdü. Y.Babayev öz kitabında bunları reallaşdırdı.

Son olaraq ədəbiyyatşünas alimin bu uğurlarının mahiyyətində auditoriya ilə bağlılığı dayanır. Y.Babayev həm də gözəl müəllimdir. Onun bütün davranışları, hərəkətləri nümunə olmağa, müəllim adına hesablanmışdır. Professor Y.Babayevin auditoriyanı gözəl bilməsi, uzun illər orta əsrlər Azərbaycan ədəbiyyatını tələbələrə öyrətməsi onun araşdırmalarına əlavə dəyər gətirmişdir. Bütün bunlar bir şəxsiyyət kimi professor Y.Babayevi tamamlayır, ədəbiyyatşünas alim kimi ədəbiyyat tariximizdə yerini müəyyənləşdirir.

**Fərrux RÜSTƏMOV**
**Əməkdar elm xadimi,**
**pedaqogika üzrə elmlər doktoru, professor**

# Cəsur döyüşçü

May ayının 9-da vaxtilə keçmiş Sovet İttifaqına daxil olmuş respublikaların əksəriyyətində faşizm üzərində Qələbənin 70 illiyi böyük təntənə ilə keçirildi. Qeyd edək ki, ötən əsrin 30-cu illərində dünya ağalığı iddiasına düşən Hitler Almaniyası qısa müddət ərzində Avropanın bir çox ölkələrini zəbt etmiş, 1941-ci il iyun ayının 22-də isə qəflətən Sovet İttifaqına hücum etmişdir. Sovet ölkəsində yaşayan bütün xalqlar, o cümlədən Azərbaycan xalqı Vətənin müdafiəsinə qalxmış və faşizmə qarşı mübarizədə böyük igidlik göstərmişlər. İkinci Dünya müharibəsi və onun tərkib hissəsi olan Böyük Vətən müharibəsi (1941-1945)öz miqyasına görə bəşəriyyət tarixində ən böyük, ən dəhşətli müharibə idi. Bir faktı xüsusi qeyd etmək kifayətdir ki, müharibənin ilk aylarında Sovet İttifaqına qarşı faşist Almaniyasının Avropada döyüşlərdə xeyli təcrübə toplamış və böyük hərbi-texniki üstünlüyə malik olan 190 diviziyası, 4 mindən çox tankı, 5 mindən çox təyyarəsi döyüşürdü. Sovetlər Birliyi bu müharibədə 28 milyon vətəndaşını itirmişdir. Lakin buna baxmayaraq, müharibə Sovet xalqının böyük vətənpərvərliyi, fədakarlığı, yenilməz iradəsi, misilsiz qəhrəmanlığı, eləcə də arxa cəbhə ilə ön cəbhənin birliyinin təmin edilməsi və digər amillər nəticəsində 1945-ci ilin mayın 9-da Sovet İttifaqının tam qələbəsi ilə başa çatmışdır. Onu da qeyd edək ki, Azərbaycan nefti və taxılı da faşizim üzərində qələbənin qazanılmasında əvəzsiz rol oynamışdır.

Qürur hissi ilə deyə bilərik ki, Böyük Vətən müharibəsində Qələbənin qazanılmasında Azərbaycan xalqının da



mühüm rolu və xidmətləri olmuşdur. Böyük Vətən müharibəsində Azərbaycandan 600 mindən çox vətəndaşı iştirak etmiş, onlardan 300 min nəfəri həlak olmuşdur. 123 nəfər azərbaycanlı döyüşlərdə göstərdikləri xüsusi qəhrəmanlıq və şücaətə görə Sovet İttifaqı Qəhrəmanı adına layiq görülmüş, xeyli sayda soydaşımız müxtəlif orden və medallarla təltif edilmişlər. Xalqımızın Həzi Aslanov, Mehdi Hüseynzadə, Gəray Əsədov, Qafur Məmmədov, İsrafil Məmmədov, Hüseynbala Əliyev, Əhmədiyyə Cəbrayılov, Tərlan Əliyarbəyov, Hacıbaba Zeynalov, Heybət Heybətov kimi igid oğulları misilsiz qəhrəmanlıq və fədakarlıq göstərmiş, faşizlərə sarsıdıcı zərbələr vurmuşlar. Xüsusi qeyd edək ki, tank qoşunları general-mayoru Həzi Aslanov 2 dəfə Sovet İttifaqı Qəhrəmanı adına layiq görülmüşdür. Qədirbilən xalqımız Böyük Vətən müharibəsində həlak olmuş soydaşlarımızın xatirəsinə, eləcə də onların ailə üzvlərinə, həmçinin həmin qanlı müharibə illərində arxa cəbhədə fədakarlıqla çalışmış soydaşlarımıza hörmət və ehtiramla yanaşır, onlara hər cür maddi-mənəvi dəstək göstərir. Xalqımızın Böyük Vətən müharibəsində faşizmə qarşı igidliklə vuruşan cəsur oğullarından biri də ADPU-nun Fizika-riyaziyyat fakültəsinin tələbəsi olmuş İsmayılov Məhəmməd Əlibaba oğludur. Onun qısa, lakin gənc nəsil üçün nümunə olan həyat yoluna birlikdə nəzər salaq.

İsmayılov Məhəmməd Əlibaba oğlu 1913-cü ilin sentyabr ayının 15-də Kürdəmir rayonunda anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra Kürdəmir Rayon Partiya Komitəsi tərəfindən verilmiş göndəriş əsasında 1930-cu ildə Bakı şəhərindəki N.Nərimanov adına Türk-Sənaye Mexanika Texnikumuna qəbul olmuşdur. 1934-cü ildə bu texnikumu bitirərək mexanik-texnik ixtisasına yiyələnmiş, elə həmin il də Dəlimmədli Neftötürmə Stansiyasında əmək fəaliyyətinə başlamışdır. Burada bir müddət yoxlayıcı və 5-ci dərəcəli çilingər köməkçisi işləmiş, bir neçə ay sonra isə müvafiq yoxlama nəticəsində 7-ci dərəcəli maşinist vəzifəsinə qəbul olunmuşdur.

4 il işlədikdən sonra Məhəmməd İsmayılov 1938-ci ildə əvvəlcə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU) nəzdində fəaliyyət göstərən hazırlıq kursunda oxumuş, hazırlıq kursunu bitirdikdən sonra isə APİ-nin Fizika-riyaziyyat fakültəsinə qəbul olmusdur. İstedadlı və zəhmətkeş bir gənc olan M.İsmayılov hər cür çətinliyə, əzab-əziyyətə qatlaşaraq təhsilini davam etdirmiş və məqsədinə nail olmaq üçün gecə-gündüz çalışmışdır. Lakin amansız müharibə bir çoxları kimi onun da arzusunu yarımçıq qoymuşdur. Müharibə başlayarkən IV kurs tələbəsi olan M.İsmayılov 1941-ci ildə orduya səfərbərliyə alınmış, əvvəlcə Gürcüstandakı hərbi məktəbdə komandir-zabit kursunu bitirmiş, elə oradan da ön cəbhəyə yola düşmüşdür. O, 5-ci ordunun Roslav atıcı diviziyasında hərbi xidmət etmişdir. Cəbhəyə yola düşərkən onun doğmalarından iki bacısı- Qəmər Yunusova və Saab Həmidova, eləcə də onların övladları arxa cəbhədə qalmışdır. Müharibə başlanandan iki il sonra bacısı Saab Həmidova vəfat etdiyinə görə onun cəbhədən rayon ilə əlaqəsi yalnız bacısı Qəmər xanımla olmuşdur. Qeyd edək ki, leytenant M.İsmayılov döyüçlərdə göstərdiyi igidliyə görə dəfələrlə müxtəlif orden və medallarla təltif edilmişdir. Belə ki, xalqımızın bu igid oğlu 1943-cü ildə "Qızıl ulduz " ordeni və "İgidliyə görə" medalı, 1944-cü ildə isə ikinci dəfə "Qızıl ulduz " ordeni ilə təltif edilmişdir. O, 1945-cilin yanvarında qəhrəmancasına həlak olmuşdur. Yeri gəlmişkən, leytenant M.İsmayılovun cəbhədən gələn məktublarını və döyüşlərdə göstərdiyi igidliyə görə verilən pul mükafatını hər ay bacısı Qəmər xanım almışdır. Eyni zamanda hərbi əməliyyatlarda göstərdiyi igidlik və şücaətə görə onun xidmət etdiyi hərbi hissənin rəhbərliyi tərəfindən Qəmər xanıma dəfələrlə təşəkkür məktubları göndərilmişdir. Onu da qeyd edək ki, vaxtilə APİ-də işləmiş Vəli müəllim 1958-ci ildə Kürdəmir rayonunda olaraq leytenant M.İsmayılovun bacısı Qəmər xanımla görüşmüş, ona Baçurin soyadlı leninqrandlı bir rus yazıçının qardaşının həyat və döyüş yolu ilə maraqlandığı və onun haqqında kitab yazmaq istədiyi barədə məlumat vermişdir. Leytenant M.İsmayılovun bacısı oğlu Fazil Həmidov və bacısı qızı Əsmayə Həmidova 1971-ci ildə Leninqrada gedərək dayılarının taleyi ilə maraqlansalar da, əfsuslar olsun ki, heç bir məlumat əldə edə bilməmişlər. Son olaraq onu qeyd edək ki, xalqımızın cəsur oğlu M.İsmayılovun və eləcə də Böyük Vətən müharibəsində faşizmə qarşı döyüşərək qəhrəmancasına həlak olmuş bütün igid oğullarımızın xatirəsi onların doğmalarının, yaxınlarının, həmçinin bütün xalqımızın yaddaşında daim yaşayır və yaşayacaqdır.

**Mənsur QÜDRƏTOĞLU**

# Kitabxanamız zənginləşir

1.Azərbaycan Respublikası Təhsil Nazirliyi, Azərbaycan Respublikasının Təh-sil Problemləri İnstitutu. "Təhsildə mənəvi-əxlaqi dəyərlər : harmonik şəxsiyyətin inkişafı" mövzusunda Beynəlxalq elmi konfransın materialları . Bakı, 5-6 dekabr 2014-cü il. Bakı: ARTPİ-nin Təhsil Texnologiyaları Mərkəzinin nəşriyyatı, 2014, 356 səh.

2.Gülrux Həsənova. "Feil zamanlarının müqayisəli tipologiyası". Bakı, "Elm və təhsil", 2014, 192 səh.

Monoqrafiyada ilk dəfə olaraq Azərbaycan və rus dillərinin materialları əsa-sında feil zamanlarının müqayisəli tipologiyası tədqiqata cəlb olunur.

3.Kazımov Nurəddin. "Məktəb pedaqogikası". Dərslik (Ali pedaqoji məktəblə-rin bakalavr pilləsi tələbələri, habelə aspirant və dissertantlar, müəllimlər üçün) Bakı, "Çıraq", 2011, 440 səh.

4. "Terror : hadisələr, faktlar, sübutlar". Bakı, "MBM", 2014, 96 səh.

5.Gülsüm Hüseynova. "Tat dilinin leksikası" ( Azərbaycan tatlarının dilinin materialları əsasında). Bakı, "Elm və təhsil", 2013, 252 səh.

Monoqrafiyada ilk dəfə olaraq Azərbaycan tatlarının dilinin leksik sistemi kompleks şəkildə tədqiqata cəlb olunmuş, qohum və qohum olmayan dillərdə müqayisəli və əlaqəli formada araşdırılmışdır.

6.Sevinc Namazova. "Pedaqoji irsimizdən: Qafur Rəşad Mirzəzadə". Bakı, "Elm və təhsil", 2014, 200 səh.

Kitabda Qafur Rəşad Mirzəzadənin pedaqoji fəaliyyətinin mühüm məqamları araşdırılır, onun təhsil-tərbiyə ilə bağlı fikirləri ümumiləşdirilir.

7.Mayıl Binnət oğlu Əsgərov. "Linqvopsixologiya və ya dilin psixologiyası". Bakı, "Elm və təhsil", 2011, 308 səh.

Bu tədqiqatda dil, nitq və söz formalarının dərketmə prosesi ilə bağlılığı, yeni dil struktur vahidinin yaranması, dilin istənilən istiqamətdə inkişafının hərəkətverici qüvvəsi olan okkazional nitq ehtiyacı kimi dilçilik məsələləri funksional-semantik, linqvistik və psixoloji baxımdan nəzərdən keçirilir, dilin və nitqin əsasını təşkil edən leksik, leksik-qrammatik və qrammatik formalar Azərbaycan və türk dilinin materialları əsasında analiz edilir.

8.İlkin Əsgərov. "Morfoloji yolla söz yaradıcılığında qeyri-məhsuldar şəkilçi-lərin rolu". (Monoqrafiya) . Bakı, "Elm və təhsil", 2014, 72 səh.

Monoqrafiya müasir Azərbaycan dilində nisbətən az məhsuldar və qeyri-məh-suldar şəkilçilərdən bəhs edir.

9.Əli Tudə. "Cənub nəğmələri". Bakı, "Azərbaycan" nəşriyyatı, 2014, 332 səh.

Cənubi və Şimali Azərbaycanın görkəmli şairi Əli Tudə 40-a yaxın kitabın müəllifidir. Vətənpərvərlik, xəlqilik, mövzu müxtəlifliyi , yüksək ideallar onun yara-dıcılığının qayəsini təşkil edir.

10.Xəlil Rza Ulutürk. "Seçilmiş əsərləri". Bakı, 2014, 608 səh.

Kitabda şairin zəngin yaradıcılıq yolunun 40 illik bir dövrünü, başqa sözlə, böyük istiqlal şairinin poetik axtarışlarının bütün mərhələlərini əhatə edən müxtəlif janrlı ədəbi nümunələr-şeirlər, poemalar toplanmışdır.

11.Paşa Əfəndiyev. "Azərbaycan folklorşünaslığının problemləri". Bakı, "Elm və təhsil", 2014, 304 səh.

Kitabda Azərbaycan folklorşünaslığının müxtəlif problemləri, Sarı Aşıq, Molla Cümə, M. P. Vaqif, M. F. Axundzadə və s. haqqında folklorşünaslıq kontekstində araşdırmalar vardır. Eyni zamanda folklorşünas P. Əfəndiyevlə bağlı elmi məqalələr də kitabda özünə yer almışdır.

12.Nağdəli Zamanov. "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" ( II kitab). Bakı, "Elm və təhsil", 2014, 496 səh.

Monoqrafiyada Azərbaycan nitq mədəniyyətinin inkişafında, təşəkkül tapmasında ulu öndər Heydər Əliyevin nitq və çıxışları kompleks şəkildə araşdı-rılmışdır. Heydər Əliyevin nitqində frazeologizmlər, ədatlar, neologizmlər, ritorik suallar, təkrarlar kimi elementlər, eləcə də əsas və köməkçi nitq hissələrinin üslu-biyyat yaratması dərindən tədqiq olunmuşdur.

13.Fərrux Rüstəmov. "Pedaqogika tarixi" və ya tarixin pedaqogikası". Bakı, "Elm və təhsil", 2014, 256 səh.

Kitabda ADPU-nun Pedaqoji fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, professor , Əməkdar elm xadimi Fərrux Rüstəmovun "Şərqdə pedaqogika tarixi" (2002), "Qərb pedaqogika tarixi" (2003), "Yeni dövrün pedaqogika tarixi" (2004), "Ən yeni dövrün pedaqogika tarixi" (2005) və "Pedaqogika tarixi" (2006) dərslik və dərs vəsaitləri ilə bağlı yazılmış rəy və resenziyalar toplanmışdır.

14.Gülsüm Hüseynova. "Tat dilinin leksik fondunun genealoji təhlili" (Azərbaycan tatlarının dilinin materialları əsasında). Bakı, 2013, 160 səh.

Monoqrafiyada ilk dəfə olaraq Azərbaycan tatlarının dilinin leksik tərkibi sis-temli şəkildə tədqiqata cəlb olunur, İran dilləri ilə ümumi olan və bilavasitə tat dilinə məxsus leksik layları, başqa dillərdən alınmalar araşdırılır.

15.Gülsüm Hüseynova. "Tat dilinin lüğət tərkibinin leksik-semantik təhlili". Bakı, "Elm və təhsil", 2014, 100 səh.

Monoqrafiyada ilk dəfə olaraq Azərbaycan tatlarının dilinin lüğət tərkibinin leksik-semantik söz qrupları araşdırılmış, tat dilinin Ərüsküş-Dağ Quşçu ləhcəsinin leksik xüsusiyyətləri tədqiq olunmuşdur.

16.Ə. A. Quliyev. "X-XI siniflərdə cəbr və analizin başlanğıcı". Bakı, "Elm" nəşriyyatı, 2014, 416 səh.

Kitabda X-XI siniflərin cəbr və analizin başlanğıcı kursunun əsas mövzuları-nın, onların tətbiqlərinin öyrənilməsi metodikası şərh olunur və bu fənnin yekun-laşdırılması, öyrənilənlərin möhkəmləndirilməsi, habelə sistemləşdirilməsində istifa-də etmək üçün 500-ə yaxın məqsədəuyğun, düşündürücü məsələ, misallar araşdırılır.

17.Elxan Məmmədli. "Şair Nəbi Borçalı: həyatı, mühiti, sənəti". Bakı, "Nurlan", 2014, 144 səh.

Kitab bütövlükdə XIX əsrin sonu, XX əsrin birinci yarısında yaşayıb-yaratmış unudulmaz el şairi Nəbi Borçalının həyat və yaradıcılığına həsr edilmişdir.

18.Vəfa İsgəndərova. "Ənənəvi nağıl formulları" (Azərbaycan və Türkiyə nü-munələri əsasında). Bakı, "Elm və təhsil", 2014, 202 səh.

19.T. Ə. Feyzullayeva. "Pediatriyanın və məktəbəqədər yaşlı uşaqların gigiyenasının əsasları" (Dərs vəsaiti). Bakı, ADPU-nun nəşriyyatı, 2014, 111 səh.

20.Ofira Qəzənfər qızı Qafarova. "Həyat bilgisi və onun tədrisi metodikası" fənni üzrə təlimin təşkili xüsusiyyətləri (metodik vəsait). Bakı, ADPU-nun nəşriyyatı, 2014, 107 səh.

21.İdrak Rəhimoğlu. "Bu da...bir ömürdü yaşadım". "AVROPA" nəşriyyatı, 2012, 274 səh.

"Bu da...bir ömürdü yaşadım" kitabında Vətən, torpaq, yurd sevgisi, Bütöv Azərbaycan arzusu, Qarabağ dərdi, məhəbbət, həsrət mövzuları və digər səpgili şeirlər yer almışdır.

22.Əlif Məmmədov. "Kombinatorika və ehtimala aid məsələlərin həlli" (orta məktəb müəllimləri və tələbələr üçün metodiki vəsait). Bakı, ADPU-nun nəşriyyatı, 2014, 131 səh.

Son illərdə ehtimal statistik metodlardan istifadə etməklə məsələlərin həllinə diqqət artmışdır, hazırda orta məktəblərin V sinfindən başlayaraq ehtimal məsələlə-ri tədrisə daxil olunmuşdur.

23.Asif Hacıyev. "Dədə Qorqud kitabı"nın şərhli oxunuşu. I kitab (Müqəd-dimə üzrə). Bakı, "Elm və təhsil", 2014, 112 səh.

"Dədə Qorqud kitabı"nın mövcud variantda şərhli oxunuşu bu monumental abidənin Drezden nüsxəsindəki yazılışına istinadən həyata keçirilməklə müxtəlif nəşrlərdə fərqli şəkildə transkripsiya edilib mübahisə obyektinə çevrilən söz, ifadə və mətn parçalarının əslinə uyğun açıqlanması məqsədi daşıyır.

24.Ülkər Əliyeva. "Azərbaycan yurd bilgisi" dərgisində folklorşünaslıq məsə-lələri. Bakı, "Elm və təhsil", 2014, 136 səh.

25.A. M. Paşayev, S. X. Ağayeva. "Nano materiallar, tədqiqat üsulları, cihazlar". (Dərs vəsaiti). Bakı, 2012, 332 səh.

Dərs vəsaiti Təhsil Nazirliyinin ali texniki təhsil müəssisələrində nanotexnologiya və nanoelektronika tədris proqramlarına uyğun hazır- lanıb.

26. "Ümumtürk kontekstində Qarabağ xalq oyunları və meydan tamaşaları" mövzusunda Beynəlxalq Elmi konfransın materialları. Bakı, "Zərdabi LTD"MMC, 2014, 520 səh.

Kitabda 14 noyabr 2014-cü ildə Tərtər rayonunda AMEA-nın Folklor İnstitutu, Tərtər Rayon İcra Hakimiyyəti, "Aşıq Şəmşir Mədəniyyət Ocağı" İctimai Birliyi və Beynəlxalq Avrasiya Mətbuat Fondunun təşkilatçılığı ilə keçirilən "Ümumtürk kontekstində Qarabağ xalq oyunları və meydan tamaşaları" mövzusunda beynəlxalq elmi konfransın materialları toplanmışdır.

27. "Qarabağ: folklor da bir tarixdir", VII kitab (Xocavənd rayonundan toplanmış folklor örnəkləri). Bakı, "Zərdabi LTD" MMC, 2014, 444 səh.

28. "Qarabağ: folklor da bir tarixdir", VIII kitab (Kəlbəcər rayonundan toplanmış folklor örnəkləri). Bakı, "Zərdabi LTD" MMC, 2014, 440 səh.

29. "Qarabağ: folklor da bir tarixdir", IX kitab (Beyləqan, İmişli, Tərtər, Bərdə və Cəbrayıl rayonlarından toplanmış folklor örnəkləri). Bakı, "Zərdabi LTD" MMC, 2014, 401 səh.

30. "Bakı- folklor örnəkləri", I kitab, Bakı, "Elm və təhsil", 2014, 308 səh.

31.Təyyar Salamoğlu. "İsmayıl Şıxlının bədii nəsri". Bakı, "E. L". NPŞ MMC, 2014, 176 səh.

32.Təyyar Salamoğlu. "Azərbaycan ədəbiyyatının müasir problemləri" (Elmi-nəzəri və ədəbi-tənqidi məqalələr). Bakı, "E. L". NPŞ MMC, 2014, 512 səh.

Kitabda müəllifin ədəbiyyat tarixi, ədəbiyyatşünaslıq, ədəbi tənqid tarixi, çağdaş ədəbi proses, türk xalqları ədəbiyyatı və b. sahələr üzrə son illərdəki araşdırmaları yer almışdır.

33.Hilal Münşi. "Azərbaycan Cümhuriyyəti". "Elm və təhsil", 2014, 316 səh.

Kitabda Hilal Münşinin 1930-cu ildə Berlində çap olunmuş, Azərbaycan mü-hacir ədəbiyyatı və tarixində xüsusi yeri olan "Azərbaycan Cümhuriyyəti" əsəri ədəbi-elmi ictimaiyyətə təqdim olunur.

34.İmrani Z. T., Zeynalova K. Z. "Azərbaycanda təsərrüfatın ərazi təşkilinin iqtisadi-coğrafi xüsusiyyətləri". Bakı, "Nafta-Press", 2014, 232 səh.

Oxuculara təqdim olunan bu kitabda Azərbaycanın tarixi, təbiəti, iqtisadiyyatı, ekologiyası, əhalinin sosial həyat və təsərrüfat fəaliyyəti, sənayesinin, kənd təsərrü-fatının, turizmin və infrastruktur sahələrinin ərazi təşkilinin iqtisadi-coğrafi xüsusiyyətləri, Xəzər dənizinin ölkə iqtisadiyyatında yeri və rolu haqqında məlumat verilir.

35. "Xanəndəlik sənəti və onun tədrisi metodikası" fənninin kurikulumu. Bakı, ADPU-nun nəşriyyatı, 2014, 34 səh.

36.N. T. Hüseynova. "İnklüziv təhsil". (Dərs vəsaiti). Bakı, ADPU-nun nəşriyyatı, 2014, 181 səh.

37.Elmira Əfəndiyeva. "Musiqi tarixi". (Qərbi Avropa musiqi tarixi). Dərslik. Bakı, ADPU-nun nəşriyyatı, 2014, 556 səh.

Dərslikdə musiqinin yaranma tarixi, forma və janrlar, həmçinin polifonist bəstəkarlar, eləcə də klassisizm, romantizm, impressionizm və digər cərəyanlar üzrə fəaliyyət göstərən peşəkar sənətkarlar haqqında məlumatlar öz əksini tapmışdır.

38.Salatın Əhmədli. "Zirzəmidə qazılan məzar". (Hekayələr). Bakı, "B-Print", 2015, 324 səh.

39.Gültac Əliyeva. "Psixologiya". Ali məktəblər üçün dərslik. Bakı, ADPU-nun nəşriyyatı, 2015, 172 səh.

Dərslikdə müasir psixologiya elminin nailiyyətləri əsasında psixologiyanın predmeti, metodları, şəxsiyyətin psixoloji xarakteristikası, şəxsiyyətlərarası münasi-bətlər, idrak posesləri və s. öz əksini tapmışdır.

40.Bəhlul Cəfərov. "Materiklərin fiziki coğrafiyası". Bakı, ADPU-nun nəşriyyatı, 2014, 278 səh.

41.Məhəmməd Teymurlu. "Politologiya". Dərslik. Bakı, "CMZ-Poliqraf", 2014, 350 səh.

42.A. C. Adıgözəlov, S. M. Nəcəfova. "Ali riyaziyyatdan məsələ və misallar həllinə aid göstərişlər". (Dərs vəsaiti). Bakı, ADPU-nun nəşriyyatı, 2014, 187 səh.

Dərs vəsaiti ali riyaziyyat kursunun bölmələrinə aid məsələ və misallar həllinə həsr olunmuşdur.

43.N. A. Verdizadə, K. Ə. Quliyev, Ə. Z. Zalov, A. S. Ələkbərov. "Optik atom spektroskopiya üsulları" (Dərs vəsaiti). Bakı, ADPU-nun nəşriyyatı, 2014, 127 səh.

Dərs vəsaitində spektroskopik analiz üsullarının əsasları, emission spektral analiz, atom-absorbsion analiz və atom fluoressensiyası metodlarının nəzəri əsasları və bu sahələrdə istifadə olunan cihazların iş prinsipləri, həmin metodlar vasitəsilə elementlərin vəsfi və miqdari təyini haqqında ətraflı məlumat verilmişdir.

44.Türkan Əsgərova. "Nəsimi dilinin frazeologiyası". Bakı, "Elm və təhsil", 2015, 240 səh.

Bu elm-tədqiqat əsərində Nəsimi dilinin frazeologiyası tədqiq olunmuşdur.

45.Salidə Şərifova. "Çağdaş Azərbaycan postmodern romanı". Bakı, "Elm və təhsil", 2015, 104 səh.

Monoqrafiyada postmodern romanların fabula və süjeti məsələlərinə, obrazların açıqlanmasına nəzər salınmışdır.

46.Nəzərov Akif Məmmədağa oğlu. "Məktəbəqədər müəssisələrdə tərbiyə və təhsilin humanistləşdirilməsi və demokratikləşdirilməsi". (Dərs vəsaiti). Bakı, ADPU-nun nəşriyyatı, 2015, 117 səh.

Tərbiyə işinin demokratikləşdirilməsi və humanistləşdirilməsi bağçanın yeniləşdirilməsində mühüm bir istiqamətdir.

47.Kərimova S. B. "Ardıcıllıq və onun limiti". (Dərs vəsaiti). Bakı, ADPU-nun nəşriyyatı, 2014, 74 səh.

48.Sevinc Sərdar qızı Sadıqova. "Müasir Azərbaycan dilinin leksikologiyası": Dərələyəz toponimlərinin linqvistik-etimoloji təhlili əsasında (Dərs vəsaiti). Bakı, ADPU-nun nəşriyyatı, 2014, 194 səh.

Dərs vəsaitində Qərbi Azərbaycan toponimlərinin tədqiqi tarixinə nəzər salınır, Dərələyəz mahalının tarixi və coğrafiyası haqqında məlumat verilir, Dərələyəz mahalı toponimlərinin-oykonim, oronim və hidronim-lərinin linqvistik-etimoloji təhlili verilir, bu ərazidəki ayrı-ayrı toponimlərin yayılma arealı göstərilir.

49. "Naxçıvan Muxtar Respublikasının 90 illiyinə həsr olunur. Bakı, "Sərbal" Group MMC, 2014, 96 səh.

Azərbaycan Respublikasının ayrılmaz tərkib hissəsi olan Naxçıvan Muxtar Respublikası milli dövlətçilik tariximizin elmi, ədəbi-mədəni irsimizin formalaşmasında, zənginləşməsində mühüm rol oynamışdır.

**Nüşabə Əmirəliyeva,**
**Elmi kitabxananın biblioqrafiya şöbəsinin müdiri**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Analitik və fiziki kimya kafedrasının müdiri, professor Nailə Verdizadəyə anası

**Əfruz xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan ədəbiyyatı tarixi kafedrasının professoru Təyyar Cavadova nəvəsi

**Ömərin**

faciəli vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti Allahverdi Hacıyevə bacısı

**Pəri xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Üzvi kimya və kimya texnologiyası kafedrasının dosenti

**Elmira Məmmədovanın**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Mülkü müdafiə və tibbi biliklərin əsasları kafedrasının baş müəllimi

**Südabə Hüseynovanın**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müəllimi Nazilə Yusifovaya anası

**Firuzə xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Tədris-metodika şöbəsinin əməkdaşı Məlahət Əliyevaya anası

**Fatimə Əliyevanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

**Redaktor əvəzi:** Mənsur İBRAHİMOV

**ÜNVANIMIZ:** Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

**Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır**

**ADPU-nun web-portalı:** adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1839
Sayı: 1500
Çapa imzalanıb: 29.05.2015-ci il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.